**AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790–0738 (Print); ISSN 2791–0911 (Online)

Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli Nizamnaməsi ilə təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436, Qeydiyyat № B236

“Azərbaycan dili və ədəbiyyat tədrisi” humanitar elmlər istiqaməti üzrə dilçiliyin və ədəbiyyatşünaslığın bütün sahələrinə aid Azərbaycan, türk, ingilis və rus dillərində orijinal, yüksək keyfiyyətli elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatın (həmçinin xarici ədəbiyyatın) tədrisi metodikasını, onun tədqiqi və təbliği məsələlərini araşdıran resenziyalı, açıq girişli elmi-metodik jurnaldır. İl ərzində dörd dəfə nəşr olunur. Jurnal dilçilik məsələləri, metodika, qrammatika, dialektologiya, mətnşünaslıq, Azərbaycan ədəbiyyatı, türk dili və ədəbiyyatı, xarici ədəbiyyat, uşaq ədəbiyyatı və folklorşünaslıq mövzularını əhatə edən bölmələrindən ibarətdir. “Nəşrlər” bölməsində elmi-pedaqoji sahədə yeni nəşr edilən kitablar tanıdılır. Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.



**TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790–0738 (Print); ISSN 2791–0911 (Online)

Approved by the Charter of the Ministry of Science and Education of the Republic of Azerbaijan dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436, Registration № B236

"Teaching of Azerbaijani language and literature" publishing original, high-quality scientific articles in Azerbaijani, Turkish, English and Russian languages in all fields of linguistics and literary (including foreign literature) criticism in the field of humanities is a peer-reviewed, Open Access scientific-methodical journal that studies the methodology, its research and promotion. Published four times a year. The journal consists of sections covering linguistics, methods, grammar, dialectology, textology, Azerbaijani literature, Turkish language and literature, foreign literature, children's literature and folklore. In the section "Publications" are presented new books published in the scientific and pedagogical field. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.

# İÇİNDƏKİLƏR / № 4, 2024

## H E Y D Ə R   Ə L İ Y E V – 1 0 1



## D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ



## M E T O D İ K A

## Ə D Ə B İ   M Ü H İ T



## T Ü R K   Ə D Ə B İ Y Y A T I

# CONTENTS / № 4, 2024

## L I T E R A R Y   E N V I R O N M E N T



## T U R K I S H   L I T E R A T U R E

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 12 – 18
doi.org/10.48445/i6382-7510-8290-x

**HEYDƏR ƏLİYEV–101**

# Ulu öndər Heydər Əliyevin Azərbaycan ədəbiyyatının inkişafında rolu

***Bilal Həsənli***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Əməkdar müəllim,
Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**XÜLASƏ**
Ulu öndər Heydər Əliyevin çoxşaxəli ictimai-siyasi fəaliyyətinin mühüm bir qolu ədəbiyyat və incəsənətlə bağlıdır. Keçmiş sovetlər məkanında fenomenal yaddaşı, xarizması ilə seçilən, xalqına sədaqətlə xidmət edən erudisiyalı şəxsiyyət, ümummilli lider Heydər Əliyev milli-mənəvi tərəqqidə ədəbiyyat və incəsənətə xüsusi önəm verirdi. O, ədəbiyyata və mədəniyyətə xalqın milli sərvəti, intellektual mülkiyyəti, özünəməxsusluğu ilə fərqlənən sənət incisi kimi yanaşırdı. Məqalədə ulu öndərin Azərbaycan ədəbiyyatının inkişafında mühüm rolu, söz sənətimizə, klassik və müasir ədəbiyyatımızın görkəmli nümayəndələrinə, onların yaradıcılığına verdiyi böyük mənəvi dəyər öz əksini tapmışdır.

**AÇAR SÖZLƏR**
ədəbiyyat, milli, inkişaf, mənəvi, klassik

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 02.10.2024
Qəbul edilib: 14.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 12 – 18
doi.org/10.48445/i6382-7510-8290-x

HAYDAR ALIYEV–101

# The Role of Great Leader Haydar Aliyev in the Development of Azerbaijani Literature

***Bilal Hasanli***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Honored Teacher,
Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**ABSTRACT**
An important branch of the great leader Haydar Aliyev's multifaceted social and political activity is related to literature and art. Haydar Aliyev, an erudite personality who served his people loyally, was distinguished by his phenomenal memory and charisma in the former Soviet Union, and national leader Haydar Aliyev attached special importance to literature and art in the national-spiritual progress. He treated literature and culture as the nation's national-spiritual wealth, intellectual property, and an art gem distinguished by its uniqueness. The article reflects the great leader's important role in the development of Azerbaijani literature, the great moral value he gave to our art of words, prominent representatives of our classical and modern literature, and their creativity.

**KEYWORDS**
literature, national, development, spiritual, classical

**ARTICLE HISTORY**
Received: 02.10.2024
Accepted: 14.11.2024

**Giriş**

Ulu öndər Heydər Əliyevin ölkəmizə rəhbərlik etdiyi dövr şair və yazıçıların geniş yaradıcılıq fəaliyyəti və bir çox istedadlı ədəbiyyatçıların yetkinlik çağına qədəm qoyduğu illərə təsadüf edir. Həmin illərdə Azərbaycanın görkəmli ədibləri Nizami, Füzuli, Nəsimi, C. Məmmədquluzadə, M. Ə. Sabir və digər sənətkarların yubileyləri, həmçinin UNESCO xətti ilə "Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyi qeyd edilmişdir.

Ulu öndər dövlətlər və xalqlar, o cümlədən insanlar arasında dostluğun möhkəmləndirilməsində, ilk növbədə, ədəbiyyat və incəsənət müstəvisində keçirilən tədbirlərin əhəmiyyətinə xüsusi önəm verirdi.

O qeyd edirdi ki, xalqımız qədim tarixə və çoxəsrlik zəngin ədəbiyyata malikdir. Biz heç vaxt milli adət-ənənələrimizdən uzaqlaşmamışıq. XX əsrdə ədəbiyyatımız və mədəniyyətimiz ideya-estetik zirvəsinə çatmışdır. Ulu öndər şair və yazıçılarımızın öz əsərləri ilə Azərbaycan xalqında daim milli ruh oyatmağa çalışmasını ədəbiyyatın ən böyük xidməti adlandırmışdır. Milli özünüdərk, milli oyanış və dirçəliş prosesi xalqa, ilk növbədə, ədəbiyyatdan keçir.

**Əsas hissə**

**Ulu öndərin rəhbərliyi dövründə ədəbiyyatımızda yeni inkişaf mərhələsinin başlanması**

Dahi şəxsiyyət H. Əliyev deyirdi ki, *"elm üçün əlçatmaz olan zirvələri ədəbiyyat və incəsənət fəth edə bilir"*. Təsadüfi deyil ki, onun 1969-cu ildə respublika rəhbərliyinə gəlişi ilə Azərbaycan ədəbiyyatı, mədəniyyəti, incəsənəti yeni bir inkişaf mərhələsinə qədəm qoydu. Məhz ulu öndərin rəhbərlik etdiyi dövrdə Azərbaycanın Xalq yazıçıları Mirzə İbrahimov və Süleyman Rəhimova, Xalq şairləri Süleyman Rüstəm və Rəsul Rzaya, görkəmli bəstəkar Qara Qarayevə, məşhur dirijor və bəstəkar Niyaziyə, müğənni Rəşid Behbudova "Sosialist Əməyi Qəhrəmanı" fəxri adı və Dövlət Mükafatları təqdim edildi.

H. Əliyev qeyd edirdi ki, klassik irsimiz məharətlə təbliğ edilməli, bu mənəvi sərvətlərin öyrənilməsində xalqa yol göstərilməlidir. O, Füzuli, Mirzə Cəlil, Sabir kimi dahiləri bəyənməyən manqurtlara qarşı mübarizə aparmağı zəruri sayırdı. Buna, həmin dövrdə qəbul edilmiş "Bədii ədəbiyyat klassikləri əsərlərinin tədqiqini, nəşrini və təbliğini yaxşılaşdırmaq haqqında", "Azərbaycanın böyük şair və mütəfəkkiri Nizami Gəncəvinin ədəbi irsinin öyrənilməsini, nəşrini və təbliğini yaxşılaşdırmaq tədbirləri haqqında", "Azərbaycanın maarifpərvər şairi Mirzə Şəfi Vazehin yaradıcılıq irsinin öyrənilməsini gücləndirmək haqqında" və s. qərarlar əsaslı sübutdur. Bu qərarların

icrası yeni elmi və bədii əsərlərin yaradılmasını, klassik irsimizin məharətlə təbliğ edilməsini, bu mənəvi sərvətlərin öyrənilməsində xalqa yol göstərilməsini tələb edirdi.

Ulu öndər Heydər Əliyevin görkəmli şair, dramaturq Hüseyn Cavidin şəxsiyyətinə və bədii irsinə münasibəti bu baxımdan xüsusilə ibrətamizdir. 1981-ci ildə şairin cənazəsinin uzaq Sibirdən gətirilib Naxçıvanda – anadan olduğu doğma torpaqda dəfn olunması, məqbərəsinin ucaldılması, ev muzeyinin yaradılması, Gəncədə Nizami Gəncəvinin məqbərəsinin bərpası, Şuşada M. P. Vaqifin məqbərəsinin ucaldılması və s. tədbirlər H. Əliyevin ədəbiyyat xadimlərinə olan ehtiram və diqqətinin bariz nümunəsidir.

O, xalqın tarixi ilə bağlı məsələlərə sənətkarın həssaslıqla yanaşması tələbini irəli sürür, bu məsələyə xüsusi önəm verərək hər bir sənətkarın öz xalqı qarşısında məsuliyyət daşıdığını, əvvəlki nəsillərin istedadı, əməyi ilə yaradılmış bütün sərvətləri mənimsəmədən, araşdırmadan yeni mədəniyyət yaratmağın, əvvəlki təcrübəyə əsaslanmadan müvəffəqiyyətlə irəli getməyin mümkün olmadığını diqqətə çatdırırdı.

H. Əliyev zəngin dünyagörüşlü, ədəbiyyatı müasir tələblər baxımından qiymətləndirən lider kimi ədəbiyyatımıza, sənətkarlarımıza daim qayğı göstərmiş, milli ruhlu, yeni səsli, yeni məzmunlu əsərlərə qarşı yönələn haqsız hücumların qarşısını almışdır. Məsələn, vaxtilə yazıçı Mövlud Süleymanlının "Dəyirman" povesti nəşr olunanda istedadlı ədibə və həyatın sərt həqiqətlərini əks etdirən bu əsərə qarşı hücumların ardı-arası kəsilmirdi. H. Əliyev həmin povesti yüksək sənət nümunəsi kimi qiymətləndirəndən sonra təzyiqlər səngidi və onun ardınca sənətkarın digər bir əsəri, "Köç" povesti nəşr olundu.

Bu gün Azərbaycan artıq dünyada tanınmış multikulturalizm mərkəzlərindən biridir. H. Əliyev hələ keçən əsrdə "Xalqların dostluğu – ədəbiyyatların dostluğudur" devizi ilə tədbirlər, mədəniyyət və ədəbiyyat ongünlüklərinin keçirilməsi üçün şərait yaradırdı.

H. Əliyev sovet hakimiyyəti illərində böyük uzaqgörənliklə "Cənubi Azərbaycan problemi"nə toxunurdu. O qeyd edirdi ki, Cənubi Azərbaycandan olan yazıçıların əsərləri respublikada və respublikanın hüdudlarından kənarda geniş təbliğ edilməlidir. Ümumiyyətlə, Cənubi Azərbaycanla ədəbi əlaqələri möhkəmləndirmək, mədəniyyətin, mənəvi yaradıcılığın bütün sahələrində əlaqələri inkişaf etdirmək, toplanmış zəngin mənəvi-estetik təcrübəni qələm yoldaşlarına ötürmək barədə düşünmək lazımdır.

**Yeni dövr Azərbaycan ədəbiyyatının son yarım əsrdəki inkişafında Heydər Əliyevin ədəbiyyat siyasətinin böyük rolu**

Ulu öndərin XX əsr Azərbaycan ədəbiyyatına verdiyi yüksək qiymətin ədəbiyyat tarixinin yaradılmasında dərin metodoloji və elmi əhəmiyyəti vardır.

H. Əliyev müstəqillik illərində yazıçıların X qurultayında ədəbiyyatımıza, sənətkarlarımıza münasibətlə bağlı bir mühüm məsələni də qeyd etmişdi: "Mən bu gün deməliyəm ki, Azərbaycanda dissident olmayıb. Amma sizin çoxlarınız dissident olmusunuz. Sizin dissident olmağınızı müsbət mənada deyirəm. Yaxşı ki, dissident olmusunuz. Əgər dissident olmasaydınız, Azərbaycan xalqında bu milli ruhu, bu əhvali-ruhiyyəni qaldıra bilməyəcəkdiniz. Əgər Bəxtiyar Vahabzadə dissident olmasaydı, Azərbaycan xalqının, gənclərinin şüuruna təsir edə bilməzdi. Əgər Xəlil Rza dissident olmasaydı, onun əsərlərinin təsiri güclü olmazdı. Bu gün bunları müsbət qiymətləndiririk. Əgər o vaxtlar onlar təqib olunmayıbsa, başqa yerlərdə olduğu kimi onları dissident adlandırmayıblarsa, onları nədənsə məhrum etməyiblərsə, demək, bu da bizim nailiyyətimizdir, bu da bizim o vaxtlar, çətin dövrdə apardığımız düzgün siyasətin nəticəsidir.

...Xəlil Rza Ulutürk kimi şəxsiyyətlər, böyük insanlar xalqımızı daim ruhlandırmış, mübarizəyə çağırmış, milli azadlıq uğrunda öz mübarizəsi ilə nümunə göstərmişlər.

Xəlil Rzanın Azərbaycan xalqı qarşısında xidmətləri əvəzsizdir. Onlar heç vaxt unudulmayacaq. Xəlil Rza xalqımıza böyük ədəbi irs qoymuş, mədəniyyətimizi, ədəbiyyatımızı zənginləşdirmişdir.

Xəlil Rza Azərbaycan xalqının milli azadlıq uğrunda mübarizəsinin ön cərgələrində getmiş, bu mübarizəyə qalxmış gənclərimizə həm alim, həm şair kimi, həm də hörmətli bir insan kimi örnək olmuşdur. O, daim Azərbaycanın müstəqilliyi duyğuları ilə yaşamış, həyatının şüurlu hissəsini buna nail olmağa sərf etmiş, böyük xidmətlər göstərmişdir.

Allaha şükürlər olsun ki, o, Azərbaycanın müstəqilliyinin şahidi olmuş, bunu görmüşdür.

Xəlil Rza bir vətəndaş, bir insan kimi bütün xüsusiyyətləri ilə həmişə sevilmişdir. Mən daim onun yaradıcılığına, insanlığına, vətəndaşlığına, ən çox cəsurluğuna, əyilməzliyinə, öz ideyalarından dönməzliyinə hörmət etmişəm, onu yüksək qiymətləndirmişəm. Ona görə də bu itki bütün Azərbaycan xalqı kimi, mənim üçün də böyük bir itkidir. Güman edirəm ki, Xəlil Rzanın parlaq həyatı, onun böyük vətəndaşlığı, milli azadlıq uğrunda mübarizliyi bütün azərbaycanlılar üçün nümunə olacaqdır. Əminəm ki, Xəlil Rza Azərbaycan xalqının qəlbində daim yaşayacaqdır"[1].

Akademik İ. Həbibbəyli yazır ki, yeni tarixi epoxada, ilk növbədə, görkəmli dövlət xadimi Heydər Əliyevin ədəbiyyat siyasətində formalaşmış ənənələri davam etdirilmişdir. Ölkəmizdə hazırkı şəraitdə dövlət səviyyəsində görkəmli sənətkarların yubileylərinin keçirilməsi, əsərlərinin latın qrafikası ilə yubiley nəşrlərinin hazırlanaraq

[1] https://lib.aliyevheritage.org/az/9165216.html

geniş oxucu auditoriyasına təqdim edilməsi onların bədii yaradıcılıq fəaliyyətlərinin inkişaf etdirilməsinə təkan verir. Həmçinin böyük xidmətləri nəzərə alınmaqla, tanınmış yazıçılara fəxri adların, fərdi təqaüdlərin və yaradıcı gəncliyin istedadlı nümayəndələrinə mükafatların verilməsi də ulu öndər tərəfindən əsası qoyulmuş ədəbi prosesin stimullaşdırılması siyasətinin konkret əməli işlərlə davamından ibarətdir.

Bütün bunlar Prezident İlham Əliyevin ədəbiyyat və mədəniyyət işinin müstəqillik dövrünün yüksək tələblərinə uyğun şəkildə inkişaf etdirilməsi tədbirlərini yeni səviyyəyə qaldırdığını qabarıq şəkildə nümayiş etdirir. Beləliklə, möhtərəm Prezidentimiz yeni tarixi epoxanın ədəbiyyat siyasətini formalaşdırır və ardıcıl olaraq da onu inkişaf etdirir. Müstəqil Azərbaycanda uğurla həyata keçirilən ədəbiyyat siyasəti yeni ədəbiyyat axtarışlarının və çağdaş ədəbi nəslin ərsəyə gəlməsi ilə nəticələnir. Müasir dövrün ədəbiyyat siyasəti azərbaycançılıq məfkurəsinin daha da zənginləşdirilməsinə xidmət edir.

Göründüyü kimi, yeni dövr Azərbaycan ədəbiyyatının son yarım əsrdəki inkişafında Heydər Əliyevin ədəbiyyat siyasətinin böyük rolu və təsiri olmuşdur. Əslində, Azərbaycanın son qırx ildəki ədəbiyyatı Heydər Əliyev epoxasının ədəbiyyatıdır. Ən yeni dövr Azərbaycan ədəbiyyatının bir məsul vəzifəsi də yeni tarixi epoxanın fonunda görkəmli dövlət xadimi Heydər Əliyevin mükəmməl, hərtərəfli şəkildə işlənmiş, ciddi ədəbi-tarixi meyarlara cavab verən bədii obrazını yaratmaqdan ibarətdir [3, s. 4].

## Nəticə

Beləliklə, ulu öndər Heydər Əliyevin ədəbiyyatla bağlı çıxışları, müsahibələri, həyata keçirdiyi respublika və beynəlxalq səviyyəli tədbirlər böyük tarixi əhəmiyyət kəsb edir. Onun hakimiyyətə gəlişi ilə Azərbaycanın ictimai-siyasi həyatında, mədəniyyət, incəsənət sahəsində köklü dəyişikliklər dövrü, yeni inkişaf mərhələsi başladı. Bu dövrdə soykökə və tarixə dönüş, milli ədəbiyyatın və mədəniyyətin dövlət səviyyəsində himayə olunması söz sənətimizin sürətli inkişafına təkan verdi, ədəbi proses, bədii söz ustaları üçün yeni yaradıcılıq üfüqləri açdı, ədəbiyyatımızda milli özünüdərkə qayıdış prosesi, milli ruh və vətəndaşlıq mövqeyi genişlənərək dərinləşdi.

## İstifadə edilmiş ədəbiyyat

1. Heydər Əliyev və ədəbiyyat. (2009). Bakı, Şərq-Qərb. 248 s.
2. Azərbaycan Prezidenti Heydər Əliyevin Azərbaycan yazıçılarının X qurultayında nitqi. (30 oktyabr 1997). https://lib.aliyevheritage.org/az/9165216.html

3. Həbibbəyli İ. (27 aprel 2010). Heydər Əliyevin dövlətçilik təlimində ədəbiyyat siyasəti və müasir dövr. "Azərbaycan" qəzeti, s. 4.
4. Hüseynova M. (2019). Missiya. Bakı, "ADPU" nəşriyyatı. 366 s.
5. Əhmədova S. (2013). Heydər Əliyev və ədəbi-tarixi proses. Bakı, Elm. 156 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 19 – 27
doi.org/10.48445/o6981-2306-7783-s

**DİLÇİLİK MƏSƏLƏLƏRİ**

# "Azərbaycan dilinin poetik linqvistikası" fənni haqqında

***Sədaqət Həsənova***
Filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim. Naxçıvan Dövlət Universiteti. Azərbaycan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**XÜLASƏ**
Məqalədə Azərbaycan dilinin poetik xüsusiyyətlərindən bəhs olunur. Bu məqsədlə "Azərbaycan dilinin poetik linqvistikası" fənninin məqsəd və vəzifələri izah edilir, onun konkret obyekt və predmetinin olması əsaslandırılır, poetik dilin qədim tarixə malik olması və zənginliyi qeyd edilir. Xüsusilə də Azərbaycan poetik dilinin inkişafı prosesində sözlərin semantik bolluğu, dilin daxili imkanlarının genişliyi diqqət çəkir. Məqalədə fənnin filoloji elmlər sırasına daxil edilməsi təqdir olunur, fənnin adına münasibət bildirilir. Belə ki, indiyə qədər fənnin adı "Linqvistik poetika" adlansa da, elmi-məntiqi baxımdan, bu ad düzgün sayılmır və təklif edilir ki, onun adı dəyişdirilərək "Poetik linqvistika" və ya "Poetik dilçilik" adlandırılsın. Bu fikri əsaslandırmaq üçün faktik materi-allara müraciət olunur.

**AÇAR SÖZLƏR**
dil, söz, fənn,
poetika, dilçilik

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 06.10.2024
Qəbul edilib: 19.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 19 – 27
doi.org/10.48445/o6981-2306-7783-s

LINGUISTIC ISSUES

# About the Subject "Poetic Linguistics of the Azerbaijani Language"

***Sadagat Hasanova***
Doctor of Philology, Professor, Honored Teacher. Nakhchivan State University. Azerbaijan.
E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**ABSTRACT**
The article talks about the poetic features of the Azerbaijani language. For this purpose, the goals and tasks of the subject "Poetic Linguistics of the Azerbaijani Language" are explained, its specific object and subject is justified, the ancient history and richness of the poetic language is noted. Especially in the process of development of the poetic language of Azerbaijan, the semantic abundance of words and the breadth of the language's internal possibilities are noteworthy. In the article, the inclusion of in the list of philological sciences is praised. In this regard, the attitude towards the name of the subject is reported. So, until now the name of the subject was called "Linguistic Poetics". From a scientific and logical point of view, this name is not considered correct, and it is suggested that the name of the subject be changed to "Poetic Linguistics" or "Poetic Language Studies". Factual materials are used to substantiate this opinion.

**KEYWORDS**
language, word, subject, poetics, linguistic

**ARTICLE HISTORY**
Received: 06.10.2024
Accepted: 19.11.2024

## Giriş

İnsanlar hələ qədim dövrlərdən başlayaraq təbiət və cəmiyyətdə müşahidə etdiklərini, görüb anladıqlarını dilə gətirmək arzusunda olmuş və bu istək, ilk növbədə, sözlərlə həyata keçmişdir. Onlar istədiklərini ifadə etmək bacarığı ilə kifayətlənməmiş, sevinc və kədər hisslərini ətrafdakı insanlarla, yaxınları ilə və ya daxili nitq sayəsində iç dünyaları ilə bölüşmüşlər. İnsanın ünsiyyət tələbatı işlətdiyi sözlərin sayını artırmış və beləliklə, dilin lüğət tərkibi zənginləşməyə başlamışdır. Bu prosesdə sözlərin semantik bolluğu, dilin daxili imkanlarının genişliyi mühüm rol oynamışdır. Əsrlər boyu “Mən dilimdən vaz keçsəm, kəsilləm dilim-dilim” düşüncəsi və fədakarlığı ilə ana dilinin qorunmasına, inkişaf etdirilməsinə xidmət göstərən xalqımız bu sahəni müqəddəs bilmiş, ən səmimi duyğularla ana dilində bəşər tarixinin çox möhtəşəm abidələrini yaratmışlar”. Onların öyrənilməsi poetik dilimizin dərin qatlarına işıq salır.

Azərbaycan poetik dili hər zaman eyni səviyyəli inkişaf xüsusiyyətlərinə malik olmamışdır. Belə ki, poetik dilimiz xalq danışıq dilinin, dialektlərin, əcnəbi dillərin, osmanlı-türk ləhcəsi elementlərinin bolluğu ilə seçilən qarışıq və mürəkkəb bir mərhələdən keçmişdir. Lakin onun tarixində sürətli inkişaf və dəyişikliklərə malik dövrlər də müşahidə olunmuşdur. Buna uyğun olaraq, hər hansı bir dövrə məxsus poetik əsərlərin dilinin öyrənilməsi həmin tarixi mərhələnin dil-üslub meyillərini müəyyənləşdirmək baxımından əhəmiyyətlidir.

## Əsas hissə

Poetik dilçilik yeni elm sahələrindəndir. Onun öyrənilməsi poeziya dili nəzəriyyəsinin elmi əsaslarının mənimsənilməsinə kömək edir. “Poeziya dilinin nəzəri və estetik əsaslarını təkmilləşdirmək, şübhə yoxdur ki, şeir yaradıcılığının aktual problem və ehtiyaclarından irəli gəlir” [2, s. 4]. Poetik əsərlərin dilçilik yönümündə öyrənilməsi onların özünəxas uyğunluqlarından irəli gələn məsələlərə aydınlıq gətirir. Linqvistik təhlil metodlarının poetik mətnlərə tətbiq olunması poetik dilçiliyin hansı prinsiplərə söykəndiyini bəlli edir. Poetik dilin öyrənilməsinə qədim zamanlardan maraq göstərilmiş, lakin Praqa dilçilik məktəbinin əsərlərində bədii dilə xüsusi önəm verilmişdir. Belə ki, burada poeziyanın linqvistik cəhətdən araşdırılması proqram səviyyəsinə çatmışdır. Poetik dilə sistemli yanaşma məhz Praqa dilçilik dərnəyinin fəaliyyəti ilə bağlıdır.

Poetik dilçilik müxtəlif zamanların dil mənzərəsinin müşahidə imkanlarını əyani şəkildə genişləndirir. Bədii əsərlər bütün dil elementlərinin poetik imkanlarını ortaya qoya bilir. Dilin müxtəlif yönlərini təqdim edən poetik əsərlər ədəbi-bədii dilimizi öyrənməkdə dəyərli bir qaynaqdır. Poetik linqvistika dilin bədii üslub baxımından

seçkinliklərini öyrədir, bədii lüğət tərkibini aşkara çıxarır, söz ustalarının ədəbi dilimizdəki mövqeyini müəyyənləşdirir. Bundan başqa, poetik dilçiliyin öyrənilməsi bədii üslubun arxaik dil bazasını, yüz illərlə dilimizdə işlənən alınmaların və bəzən də vətəndaşlıq hüququ qazanmayan əcnəbi sözlərin üslub çalarlarını, yeni yaranan sözlərin, nitq istisnalarının, dialekt leksikasının, xalq danışıq dili elementlərinin, müəlliflərin öz qələminə məxsus dil faktlarının istifadə dərəcəsini göstərməklə bütöv bir linqvistik mənzərənin təsvirini verir. Bu prosesdə bədii təsvir və ifadə vasitələrinin bədiilikdə əhəmiyyəti və frazeoloji birləşmələrin istifadə üsulları məsələsi də unudulmamalıdır.

"Poetik linqvistika" "bədii dilçilik" deməkdir. Yanlış olaraq bu fənn "Linqvistik poetika" adlandırılmışdır. Kamil Vəliyevin "Türk Dili Araştırmaları Yıllığı" elmi dərgisinin 1987-ci il tarixli 35-ci cildində çap olunmuş "Lingvistik poetika, poetik sintaksis, dastan poetikası haqqında bir neçə söz" adlı məqaləsinin ilk ifadəsi də "linqvistik poetika" adlanır [4, s. 297 – 304]. "Linqvistik" sözünün mənası "dilçi"dir. Bu mənada, "dilçi poetika", yəni "linqvistik poetika" ifadəsinin işlədilməsi məntiqi baxımdan düzgün deyil. Lakin "poetik dilçilik" həm qrammatik, həm də məntiq baxımından daha dəqiq və düzgün ifadədir. Ona görə fənnin adı "Linqvistik poetika" adlandırılsa da, həmin mənada "poetik linqvistika" terminini işlətməyi lazım bilirik. Bu mənada, Kamil Vəliyevin araşdırmalarındakı "poetik sintaksis" termini yerində işlədilmişdir. "Linqvistik poetika" məntiqi ilə yanaşsaq, digər termin yanlış olaraq "sintaktik poetika" adlandırılmalıdır. Deməli, "poetik" sözü "linqvistika"nı təyin edən leksem olub, ondan əvvəl işlədilməlidir.

Ədəbi dilin üslubları içərisində daha geniş yayılan və tarixən qədim olan bədii üslub milli dilimizin dərindən öyrənilməsinə imkan yaradır. Belə ki, dildə söz, ifadə, cümlə vasitəsilə yeni mənaların yaradılması, fikirlərin ifadə imkanları, dil faktlarının semantik inkişafı özünü daha çox bədii üslubda göstərir. Bu baxımdan, poetik dilin araşdırılması önəmli məsələlərdəndir. Xalqın və müxtəlif söz ustalarının poetik dil sənətinin öyrənilməsi bir tərəfdən də ədəbi-bədii dilin dərin qatlarını üzə çıxarır. "Poetik linqvistika" elmi xalqımızın bədii dil mədəniyyətinin yaranması, formalaşması və inkişafı tarixinə aydınlıq gətirməkdə də faydalıdır.

Bədii mətnlərdə dilin müxtəlif səviyyələrinə aid dəyərli materiallarla qarşılaşmaq mümkündür. Dilin bütün səviyyələrində ifadəlilik "Poetik linqvistika" elminin tədqiqat obyektidir. Bu baxımdan, fonetikanın, leksikologiyanın, söz yaradıcılığının, morfologiyanın, sintaksisin bədii imkanlarının araşdırılması poetik linqvistikanın mahiyyətini aşkara çıxarır. "Poetik linqvistika" hər hansı bir mətnin linqvopoetik quruluşunda ifadəliliyin vacib element olduğunu təsdiq edir.

Həyatın bədii təsvir və tərənnümünü təqdim edən bədii əsərlər məlumatları obrazlı şəkildə çatdıran vasitədir və bu, dilsiz mümkün deyil. Poetik səviyyə dil vasitəsilə reallaşır. Ona görə də poetikanın dil səviyyələri müstəvisində öyrənilməsi zəruridir.

“Poetik linqvistika” fonoloji, leksik, morfoloji və sintaktik materialların bədii dilə gətirdiyi uğurları müəyyənləşdirməkdə əhəmiyyətli elm sahələrindəndir. Dildə nəinki səslərin, sözlərin, ifadə və cümlələrin, hətta adi kiçik işarələrin də böyük əhəmiyyəti vardır. Bu mənada, durğu işarələrinin üslub imkanlarının araşdırılması maraqlı məsələlərdəndir. Yeri gəldikcə “Poetik linqvistika”nın öyrənilməsində həmin mövzu unudulmamalıdır. Hər hansı bir əsərin linqvistik təhlili dil sisteminin bütün laylarına müraciət deməkdir.

Dilin milliləşməsi prosesi daha çox poetik əsərlərdə özünü göstərir. Bu, təbii haldır. Çünki bədii üslub bir sıra funksional üslublardan seçilərək ümumxalq dilinə əsaslanır. Doğrudur, bədii üslubda ədəbi dilə daxil olmayan söz və ifadələrlə də qarşılaşırıq ki, bu, əsasən, sözügedən üslubun “qonaqpərvərliyi” ilə bağlıdır. Belə ki, qeyri-ədəbi dil faktlarını daha çox bədii üslubda müşahidə etmək mümkündür. Digər tərəfdən, belə faktlar bədii-üslubi funksiyaların daşıyıcıları olduğu üçün qiymətlidir. Hər bir dövrün dil siyasəti ilə bağlı məsələlər həmin zamanın yazarlarının ədəbi-bədii görüşlərinə təsir göstərir. Milliləşmə üçün təhlükə hesab olunan leksik-qrammatik vahidlər zaman-zaman dilimizdən sıxışdırılıb çıxarılmışdır ki, məhz bunun üçün poetik dilimizə minnətdarıq. Poetik dilimizin milli baxımdan inkişafı nəticəsində xəlqiləşməyə qarşı duran lazımsız alınmalar ona təslim olaraq aktiv leksikanı tərk etmişdir. Bu mənada, bir zaman fəal leksikaya daxil olan “qiraətxana”, “lektor”, “ictima”, “firqəçi”, “fərəc vermək” və s. kimi söz və ifadələr öz yerini milli vahidlərə vermişdir. Bu prosesdə poetik dilin əhəmiyyətli rolu vardır.

Dil düşüncəni əks etdirən ilkin vasitədir. Milli keyfiyyətlərin qorunması dilin qorunmasından asılıdır. Hazırda bədii üslub dilimizin özəlliyini qoruyur. Bu üslub dilimizin aktual problemlərini də üzə çıxara bilir. Diqqətçəkici məsələdir ki, son dövrlərdə söz sənətinin araşdırılmasına, sənətkarlıq məsələlərinə maraq çoxalmışdır. Aparılan həmin tədqiqatlarda sənətkarlığın tərkib hissəsi olan dil materialı mühüm yer tutur. Sözsüz ki, həmin araşdırmalarda poetik əsərlərin müstəsna mövqeyi vardır. Ədəbi prosesin tətbiqi praktik iş baxımından faydalıdır, ona görə ki həmin prosesdə ədəbi-bədii səviyyənin yüksəlişinə imkan yaranır. Sənətkarların sözdən fərdi istifadə bacarığının konkret örnəklərlə göstərilməsi poetik linqvistikanın vəzifələrindən biridir. Bu elm sahəsi emosional cəhətlərin ifadəsində poetik dilə xüsusi diqqət yetirir. Bu zaman səs sistemindən başlamış mətn sintaksisinə qədər özünü göstərən özəl cəhətlər poetik linqvistika sayəsində üzə çıxır.

Poetikanın ölçüsü dillə müəyyənləşir. Azərbaycanda poetik əsərlərin səviyyəsi həmişə qaneedici olmuşdur. Bu fikri həmin əsərlərin dili haqqında da ürəklə səsləndirmək olar. Bu mənada filologiya elmləri doktoru, dosent Vaqif Yusiflinin aşağıdakı fikri diqqətəlayiqdir: "Azərbaycan şeiri poeziyamızın yaşarı ənənələrinə bağlıdır, eyni zamanda müasir şeir mədəniyyəti, həyatı, gerçəkliyi inikas nöqteyi-nəzərindən də yeni, novator keyfiyyətləri ilə diqqəti cəlb edir" [5, s. 74]. Poetik dildə sözlər adi cəhətlərdən başqa, üstün keyfiyyətləri də ifadə edə bilir. Belə ki, fikirlərin ifadəsində sözlərin daha dərin məna qatları üzə çıxır. Poetik mətnin canlı və maraqlı olmasında üslub fiqurları və onların əsasında dayanan poetizmlər mühüm əhəmiyyət daşıyır. Poetizmlər dilin estetik gözəlliyini bildirən və qoruyan qiymətli bədii dil vahidləridir. Sözlərin məna yaxınlığı zəminində onların əsas və məcazi mənaları əmələ gəlmişdir. Həmçinin məna çalarının zənginliyi poetik çalarların yaranmasına da təkan vermişdir.

Ədəbi dil müstəvisində gedən proses və dəyişmələr poetik dilə təsir edir və burada əyaniləşir. Söz sənətkarları bədii yaradıcılıq dönəmində ədəbi dilimizi inkişaf etdirib zənginləşdirməkdən başqa, dil quruculuğuna da biganə qalmır, bu prosesdə fəal iştirak edir, əsərləri ilə dil məsələlərinə münasibət bildirirlər. Dilin inkişaf edib zənginləşməsində əsas yük nitqin üzərinə düşür. Nitqin söz-ifadə və fikir bolluğunda isə dilin rolu əvəzsizdir. Nitq mürəkkəb sistemə malik olan dilin ifadə imkanlarını genişləndirən fəaliyyət vasitəsidir.

Nitqin rəngarəngliyi, ilk növbədə, dilin leksik-qrammatik tərkibindən, daha sonra dildəki sözlərin mənalarından asılıdır. Bu məsələdə çoxmənalılığın böyük rolu vardır. Sözsüz ki, sözlərin rəssamı, onların rənglərini duyanlar söz ustalarıdır. Onların sözdən bacarıqla istifadəsi məqsəd və ideyanın təqdimində, əsərin ruhunun duyulmasında əsas məsələlərdəndir. Nitq mədəniyyəti bilavasitə şifahi nitqlə bağlı olsa da, onun tərkibinə yazı mədəniyyəti də daxildir. Nitq mədəniyyəti özünəməxsus prinsiplər əsasında qurulur. Hər bir yazarın nitq mədəniyyəti onun dildən faydalanma dərəcəsini göstərir.

Poetik əsər dil vasitəsinə ifadə edilən təfəkkür və mənəviyyatın göstəricisi kimi təzahür edir, müəlliflərin yaradıcılıq simasını göstərir, imzalarını təsdiq edir. Bu anlamda, poetik əsərlər yalnız gerçəkliyin deyil, həm də bədii imkanlarla zənginləşdirilmiş obrazlılığın ifadəsidir. Poeziyanın daxili mahiyyətindən irəli gələn elə keyfiyyətlər vardır ki, onlar linqvistik təhlillər vasitəsilə gerçəkləşə bilir. Poetik mətnlərin linqvistik təhlili adi həqiqətləri sənət hadisəsi kimi təqdim etmək gücünə malikdir. Sözlərin anlam fəallığı, bədii gücü dil təhlillərində daha qabarıq şəkildə görünür.

"Poetik linqvistika" fənninin ali məktəblərin tədris proqramlarına salınma tarixi nis-

bətən yaxın dövrə təsadüf edir. Belə ki, Azərbaycan dili ilə bağlı fənlərin tədris tarixinə nəzər saldıqda əvvəllər belə bir fənnin öyrədilməsi faktı ilə qarşılaşmırıq.

Fənnin tədris tarixi bir qədər yaxın olduğundan, daha doğrusu, çağdaş dövrümüzlə səsləşdiyindən onun haqqında yazılanlar kifayət qədər deyil. Daha doğrusu, bu fənnin proqram, metodik vəsait və dərsliyi yoxdur. “Azərbaycan dilinin poetik linqvistikası” fənninin əsas mövzusu poeziya dilidir. Bu fənnin məqsədi bədii üslubda yazılan əsərlərin, xüsusilə də nəzm əsərlərinin dil xüsusiyyətlərini öyrətməkdir. Bu məqsəd aşağıdakı vəzifələrin yerinə yetirilməsini tələb edir:

– bədii mətnlərin dilini öyrənmək;
– söz sənətkarlarının sözdən fərdi istifadə bacarığını konkret misallarla aydınlaşdırmaq;
– milli dilin incəliklərini ifadə edən və qoruyan poetik əsərlərin linqvo-fonetik xüsusiyyətlərini öyrənmək;
– bədii dilin leksik keyfiyyətlərini müəyyənləşdirmək;
– dil vasitələrinin semantik funksiyalarını aydınlaşdırmaq;
– poetik əsərlərin bədii-morfoloji əlamətlərini təyin etmək;
– milli təfəkkürün məhsulu olan və yüzilliklərin, minilliklərin sınağından çıxmış, yaranışdan poetikliyi daxilində yaşadan frazeoloji birləşmələrin və frazem xarakterli dil ünsürlərinin bədii imkanlarını aydınlaşdırmaq;
– poetik dilin əsas xüsusiyyətlərinin sintaksis sahəsinə aid olduğunu nəzərə alaraq bədii dilin sintaktik özəlliklərini öyrənmək və s.

Poetik linqvistika bir sıra elm sahələri ilə əlaqəlidir. Bu mənada, onu dilçilik elminin bütün sahələri ilə bağlayan cəhətlər vardır. Məsələn, fonetika, leksika, söz yaradıcılığı, qrammatika (morfologiya və sintaksis), semasiologiya, dialektologiya, lüğətçilik, ədəbi dil tarixi, tarix, ədəbiyyat və s. elm sahələrinin “Poetik linqvistika” ilə bağlılığı təbiidir. Məlumdur ki, fonetika danışıq səslərini öyrənir. Poetik əsərlərin dilində də danışıq səsləri üslub məqamlarının fəallığı ilə diqqət çəkir. Belə əsərlərin dilində, ritm və ahəngin yaranmasında, səslənmə zənginliyində, ümumiyyətlə, poefonetik imkanların ortaya çıxmasında fonetika ilə “Poetik linqvistika” fənni sıx əlaqədə olur.

Dildəki sözlər leksikologiyanın məsələlərindən biri kimi poetik əsərlərin dilində də önəmlidir. Poetik əsərlərdəki mənadan-mənaya adlayan, bədii don geyindirilən sözlər dilin leksikasına aiddir. Bədii əsərlərdəki poetik sözlər ilkin olaraq dilin leksik materialıdır. Lakin həmin material poetik dildə fərqli bir bacarıqla işlənir. “Şeirin insanları böyük qayə və ictimai müddəalar ətrafında birləşdirmə qüdrətini, insanlar arasında yeni düşüncə və münasibətləri möhkəmləndirməsini dönə-dönə qeyd etmişlər” [3, s. 5].

Poetik linqvistikada söz yaradıcılığı orijinal və diqqət çəkən məsələlərdəndir. Sözsüz ki, sözlərin yaranma yolları nəzəri baxımdan dilçilik elminin “Söz yaradıcılığı”

bölməsinə aiddir. Poetik dildə ayrı-ayrı yazarlar tərəfindən dərin bədiiliyə malik söz və ifadələr (daha çox ifadələr) yaradılmasında dilçiliyin həmin bölməsi əsas rol oynayır.

"Poetik linqvistika" dilçilikdə mühüm mövqeyi olan qrammatika elminin həm morfologiya, həm də sintaksis bölmələri ilə bağlıdır. Belə ki, nitqi təşkil edən sözlər hər hansı bir nitq hissəsinə aiddir ki, onları öyrənən elm morfologiyadır. Fərq burasındadır ki, poetik dilçilikdə həmin nitq hissələri bədiilik baxımından maraqlıdır, lakin material olaraq yenə də nitq hissələrindən istifadə olunur.

Nitqin mükəmməlliyində cümlənin əhəmiyyəti məlumdur və onsuz hər hansı bir fikir düzgün ifadə oluna bilməz. Bu mənada, poetik dilçiliyin söz birləşmələri və cümləni öyrənən elm kimi sintaksislə əlaqəsi dərindir.

"Poetik linqvistika" elminin semasiologiya ilə bağlılıqları sözlərin leksik-semantik qruplarının bədii imkanları baxımından zəruridir.

Poetik dildə dialekt faktlarının işlənməsi fənnin dialektologiya ilə əlaqəsini əsaslandırır.

Bədii dildə bəzən elə sözlər işlənir ki, onların izahında lüğətlərə ehtiyac yaranır. Bu, fənnin lüğətçilik elmi ilə bağlılığını zəruriləşdirir.

Poetik dilin tərkibindəki faktların mənşəyinin araşdırılmasında etimologiya elminin nəzəri məlumatları lazım olur. Bu məsələdə "Poetik linqvistika" ilə etimologiya elminin əlaqələri üzə çıxır.

"Poetik linqvistika" fənninin "Azərbaycan ədəbi dili tarixi" ilə əlaqəsi daha möhkəmdir. Ona görə ki "Poetik linqvistika" müxtəlif dövrlərə aid olan ədəbi-bədii dil materiallarının üzərindəki təhlillərə əsaslanır.

Bundan başqa, "Azərbaycan dilinin poetik linqvistikası" fənninin üslubiyyat, tarix və coğrafiya elmi ilə əlaqələrini də əsaslandırmaq mümkündür. Bu əlaqələr fənnin dilçilik elminin müstəqil bir sahəsi kimi formalaşıb inkişaf etdiyini göstərir.

**Nəticə**

Beləliklə, "Poetik dilçilik" obyekt və predmeti olan elm sahələrindəndir və filoloji istiqamətdə təhsil alanlar üçün zəruri fənlərdən biridir. Dilçilik elminin müstəqil bir qolu olaraq inkişaf edən və bu prosesdə yeniliklər qazanan elmin "Linqvistik poetika" deyil, "Poetik linqvistika" və ya millilik baxımından daha düzgün olaraq "Poetik dilçilik" adlandırılması məqsədəuyğundur.

**İstifadə edilmiş ədəbiyyat**

1. “Dilimiz milli sərvətimiz”. (2018). Bakı, Adiloğlu. 58 s.
2. Hüseynov M. (2013). Azərbaycan poeziyasının dil və üslub problemləri (1960 – 80-ci illər). Filologiya üzrə elmlər doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı. 58 s.
3. Hüseynov M. (2008). Dil və poeziya. Bakı, Elm. 434 s.
4. Vəliyev K. (1987). Linqvistik poetika, poetik sintaksis, dastan poetikası haqqında bir neçə söz. Cild 35, s. 297 – 304, 01.01.1992. “Türk Dili Araştırmaları Yıllığı – Belleten”. https://dergipark.org.tr
5. Yusifli V. (2019). Azərbaycan şeiri. (2018); Ədəbi proses. (2018). VI cild. Bakı, Hədəf. s. 74 – 98.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 28 – 33
doi.org/10.48445/l2382-7655-4057-c

**DİLÇİLİK MƏSƏLƏLƏRİ**

# Söz-cümlənin sintaktik-semantik xüsusiyyətləri

***Ədalət Abbasov***
Filologiya elmləri doktoru, dosent, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

***Həmzə Əliyev***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: hemze.eliyev1965@mail.ru
https://orcid.org/0000-0003-2344-8388

**XÜLASƏ**
Heç bir daxili üzv əsasında formalaşmayan, izahedici, aydınlaşdırıcı sözlər vasitəsilə genişləndirilməyən, üzvlənməyən (üzvlərinə ayrılmayan) sözdən və söz birləşmələrindən ibarət cümləyə söz-cümlə deyilir. Söz-cümlənin semantik məzmunu subyektin obyektə münasibətinin müxtəlifliyi baxımından rəngarəngdir. Emosional-qiymətləndirici söz-cümlə – danışanın ifadə olunan fikrə, şəraitə, hadisə və predmetlərə münasibətini əks etdirir. İnkar söz-cümlə – ya verilən suala inkari cavab kimi işlənən, ya da başqasının fikrinə etiraz münasibətinin təzahürü olaraq ifadə edilən söz-cümləyə deyilir. Sual söz-cümlə – müsahibin fikrinə modal qiymətvermə məqamında işlənib, təsdiq və inkar bildirən "hə", "yox" ədatları və ya "heç", "yaxşı", "belə", "elə" və s. sözlərlə ifadə edilir. Beləliklə, aydın olur ki, söz-cümlənin sintaktik-semantik tiplərinin zənginliyi əsasən subyektin obyektiv gerçəkliyə münasibətinin məzmunundan asılıdır.

**AÇAR SÖZLƏR**
izahedici sözlər,
semantik məzmun,
emosional-qiymətləndirici
söz-cümlə, stilistik məqam,
semantik rəngarənglik

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 22.10.2024
Qəbul edilib: 29.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 28 – 33
doi.org/10.48445/l2382-7655-4057-c

**L I N G U I S T I C   I S S U E S**

# Syntactic-Semantic Features of the Word-Sentence

***Adalat Abbasov***
Doctor of Philological Sciences, Associate Professor, Department of Azerbaijani Language and its Teaching Technology, Azerbaijan State Pedagogical University.
Azerbaijan. E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

***Hamza Aliyev***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Department of Azerbaijani Language and its Teaching Technology, Azerbaijan State Pedagogical University.
Azerbaijan. E-mail: hemze.eliyev1965@mail.ru
https://orcid.org/0000-0003-2344-8388

**ABSTRACT**
A sentence consisting of words and phrases that are not formed on the basis of any internal member, are not expanded through explanatory or clarifying words, are not divided into members (are not inseparable into members) is called a word-sentence. The semantic content of the sentence is diverse in terms of the subject's attitude towards the object. Emotional-evaluative sentence - reflects the attitude of the speaker to the expressed idea, conditions, events and objects. A negative sentence is a sentence that is used either as a negative answer to a question, or as a manifestation of an attitude of opposition to someone else's opinion. The question is phrased in the interviewee's opinion at the point of modal assessment, affirmative and negative verbs "yes", "no" or "none", "good", "so", "so" etc. expressed in words. Thus, it becomes clear that the richness of syntactic-semantic types of the sentence mainly depends on the content of the subject's attitude to objective reality.

**KEYWORDS**
explanatory words,
semantic content,
emotional-evaluative
word-sentence, stylistic point,
semantic diversity

**ARTICLE HISTORY**
Received: 22.10.2024
Accepted: 29.11.2024

**Giriş**

Heç bir daxili üzv əsasında formalaşmayan, izahedici, aydınlaşdırıcı sözlər vasitəsilə genişləndirilməyən, üzvlənməyən (üzvlərinə ayrılmayan) söz və söz birləşmələrindən ibarət cümləyə *söz-cümlə* deyilir. Bu cümlələrdə baş üzvlərə və ikinci dərəcəli üzvlərə subyektin obyektə münasibəti kontekstində sadəcə işarə edilir. Söz-cümlənin semantik məzmunu subyektin obyektə münasibətinin müxtəlifliyi baxımından rəngarəngdir.

**Əsas hissə**

**Söz-cümlənin sintaktik-semantik mənaları**

*Emosional-qiymətləndirici söz-cümlə* – danışanın ifadə olunan fikrə, şəraitə, hadisə və predmetlərə münasibətini əks etdirir. Adətən belə cümlə tipləri nidalardan və nidalaşmış sözlərdən ibarət olur. Məsələn:

– Deməli, yazırdın? – Yazırdım... – Kimə yazırdın? – Camaat gəlib xahiş edirdi, mən də yazırdım. – Əhsən! Afərin sənə!

*İnkar söz-cümlə* – ya verilən suala inkari cavab kimi işlənən, ya başqasının fikri ilə razılaşmamağı bildirən, ya da danışanın öz fikrini inkar edən söz-cümləyə deyilir. İnkar söz-cümlə əsasən inkar ədatları “yox”, “xeyr”, habelə “əsla”, “qətiyyən”, “heç”, “heç vaxt” sözləri ilə ifadə edilir. Məsələn:

– Sizin başınıza hava gəlib, siz ağlınızı itirmişsiniz, – Horri Heldmen yalnız bunları deyə bildi. – Yox, belə deyil! – Dranqo sərt şəkildə onun sözünü kəsdi.

– Yadınıza salın, komissar, – Dranqo canlandı, – yaxşı-yaxşı yadınıza salın: orda boz rəngli xırda bir açar yox idi ki? Təxminən, bax bu boyda, – deyə Dranqo barmağı ilə göstərdi, – lap balaca. – Yox. Burası həməzənlər düşərgəsi imiş.

– Bunların kişiləri yoxdurmu? – Xeyr. Bu söhbətdən sonra Alpaqay neçə vuruşmada olduğunu soruşdu. – Heç ölümdən qorxursanmı? – deyə soruşdu və gülümsədi. – Əsla!

Bəzi məqamlarda inkari söz-cümlələrdən əvvəl təsdiq bildirən “əlbəttə” modal sözü işlənir. Bu zahiri struktur ilk baxışda təsdiq və inkari söz-cümlənin paralel işlənməsi qənaətini yaradır [2, s. 13]. Məntiqə görə, təsdiq və inkari münasibət eyni sintaktik-semantik məzmunda vəhdət şəklində təzahür edə bilməz. Belə hallara yalnız seçim məqsədi daşıyan stilistik məqamlarda rast gəlinməsi istisnadır. Məsələn: – Düşün və qərarını ver: ya hə, ya yox!

Yuxarıda qeyd etdiyimiz təsdiq və inkari söz cümlənin eyni zamanda işləndiyi məqamlarda verilən suala inkari cavabla yanaşı, öz fikrini bildirmə və başqasının fikri ilə razılaşmamaq məzmununun ifadəsi önə çəkilir. Məsələn:

– Siz bunu ciddi deyirsiniz? – heyrətə gəlmiş Stiven Ross handan-hana dilləndi. – Əlbəttə ki, yox. – Qanacaq yaxşı şeydirsə, vədə əməl də heç pis şey deyil. – Nə vədə?! – Mənə verdiyin vədi unutdun? – Şübhəsiz, xeyr!

Nümunələrdən də göründüyü kimi, ifadə olunan fikrə danışanın münasibəti inkar cavabla yanaşı təzahür etdirilir.

*Sual söz-cümlə* müsahibin fikrinə modal qiymətvermə məqamında işlənib, təsdiq və inkar bildirən "hə", "yox" ədatları və ya "heç", "yaxşı", "belə", "elə", "aydındır" və s. sözlərlə ifadə edilən söz-cümləyə deyilir [3, s. 68]. Məsələn:

– Çöldən içəri girəndə hay-küylə qabağıma yüyürənim olsun. Boynuma atılanım olsun... Qumaş arvadın alın qırışları sıxlaşdı: – Həəə? Getməyim sərfəlidir. Orda yaramazın iyrənc sifətini birdəfəlik unudaram, çoxdandı kütləvi yerlərə ayağım dəymir. Getmək lazımdır! – Yaxşı? Əgər bilsəm ki, bu hərəkət sonuncudur, bir daha təkrarlanmayacaq, mənə çətin də olsa, əfv eləyərəm. – Ona arxayın ol! – Əfsun ilan dili çıxardı: – Qəti söz verirəm: sonuncudu! – Yaxşı, bağışladım. – Demək, bağışladın, elə?

*Təsdiq söz-cümlə* ya verilən suala cavab olan, ya danışanın razılığını bildirən, ya da danışanın fikrini təsdiq edən söz-cümləyə deyilir [1, s. 56 – 60].

Üzvlənməyən təktərkibli cümlənin bu növü aşağıdakı sözlərin və birləşmələrin köməyi ilə düzəlir: "bəli", "əlbəttə (ki)", "şübhəsiz (ki)", "sözsüz (ki)", "yaxşı", "təbii (ki)", "yəqin (ki)", "çox gözəl", "çox əla", "çox pakizə", "hə", "həri", "həri ya", "bəli", "bəli a" və s. Məsələn: Bir nəfər odunçu yolla getdiyi halda onu bir filosof görür. Anamın şələsi kimi, o da odunu nizamla yığıbmış, filosof onu saxlayır: – Bu odunları belə səliqə ilə üst-üstə kim yığıb? – soruşur. – Özüm, – o da cavab verir. – Təzədən bir də açıb yığa bilərsənmi? – Əlbəttə. Əfsun ərklə müdaxilə etdi: – Qarabağa Yardım Komitəsi də dövrün, indiki zamanın mühüm sahəsidir. Çox yəqin ki, bu işi də məhz bu sahələrə görə sizə etibar ediblər. – Bəli.

Təsdiq söz-cümlənin iki məna incəliyini qeyd etmək yerinə düşər:

a) Təsdiq söz-cümlənin müəyyən bir qismi ("hə", "bəli", "əlbəttə", "şübhəsiz", "yaxşı") özündən əvvəl söylənən fikrə kəskin, tamamlayıcı cavab bildirir, özündən sonra izahedici, aydınlaşdırıcı sözlərin işlənməsinə yer qoymur [6, s. 37]. Məsələn: Qıraqdan baxanlar da görsünlər ki, nənənin qayğısına qalanlar çoxdur... Necə sözdür, Mara Abramova? Siz dünya görmüş qadınsınız, belə yaxşıdır, ya yox? – Hə. Yaxud: Əfsun biləyini çırmayıb saatına baxdı: – Onda bir az da yatsın, çox əziyyət çəkib, heydən tamam düşüb. – Hə.

b) Təsdiq söz-cümlə – özündən əvvəlki fikrə münasibətinə görə, nisbətən qəti və tam cavab ifadə etmir. Odur ki əlavə tamamlayıcı sözlərə izahedici ifadələrə ehtiyac duyulur. Həmin ifadələr (aydınlaşdırıcı) ya yerində işlədilir, ya da mətnə (əsasən verilən sualın məzmununa) görə təfəkkürdə düşünülür. İdraki təsəvvür cəhətdən də

təsdiq söz-cümlənin bu tipinin xəbəri və mübtədası zehində canlandırılan təktərkibli cümlələrə oxşayır [5, s. 124]. Bu, təktərkibli cümlələrin geno-sintaktik xüsusiyyəti sayılır. Məsələn: – Əllərinin ikisini də qaldır yuxarı. Yəqin mənimlə zarafat eləyir – dedim, əllərimi qaldırdım yuxarı. – Tərpənmə. – Yaxşı, tərpənmirəm. – Serj sizin otağa qalxmışdı? – Dronqo soruşdu. – Hə. Mən əvvəlcə ona parkda rast gəlmişdim. O, iki dəfə yerə yıxılmışdı. – Siz də onu öz otağınıza gətirdiniz, eləmi? – Hə, mən öz otağıma gətirdim.

**Nəticə**

Nümunələrdən göründüyü kimi, söz-cümlənin məzmunu özündən əvvəlki mülahizəni bütöv tərzdə yekunlaşdırmır. Bu səbəbdən də əlavə izahedici sözlərin işlənməsi üçün zərurət duyulur. Təsdiq və inkar söz-cümlələrin sintaktik-semantik mənasının rəngarəngliyinin yaranmasında onun ifadə tərzinin müxtəlifliyinin rolu böyükdür. Təsdiq və inkar söz-cümlələr müxtəlif ifadə tərzlərində tələffüz edilir:

1. Eyni söz-cümlənin təkrar olunması yolu ilə.
2. Bir neçə söz-cümlənin yanaşı işlədilməsi yolu ilə.
3. Modal sözlər, bəzi nidalar, təkid, məhdudiyyət bildirən ədatların söz-cümlə ilə birlikdə işlənməsi yolu ilə [4, s. 298].
4. Təhrikedici söz-cümlə əvvəlcə söylənən fikrə və ya yaranan vəziyyətə danışanın münasibətini, başqasını bir işə təhrik etdiyini bildirən söz-cümləyə deyilir. Bu cümlələr məzmununda hərəkət anlayışı olan nidalar və nidalaşmaqda olan sözlərdən ibarət olur. Həmin sözlər aşağıdakılardır:

Marş! Haydı! Savaş! Urra! Hə! Məsələn: Eldar: Ha...ha...ha... buna bax, buna bax, Arşak! Haydı! Çıxar qılıncını, südəmər uşaq. Durna eyni pıçıltı ilə: – Sonra danışarıq, – dedi. Əfsunun dili sızıldadı. – Yəni gözləyək deyirsən? – Hə!

Bu cür söz-cümlələr sintaktik məzmundakı təhrikediciliyin qətiyyətlilik dərəcəsinə görə iki yerə bölünür:

a) başqasını bir işə bilavasitə təhriketmə,
b) başqasını bir işə qismən təhriketmə.

Beləliklə, görürük ki, söz-cümlənin sintaktik-semantik tiplərinin zənginliyi subyektin obyektiv gerçəkliyə münasibətinin məzmunundan çox asılıdır.

## İstifadə edilmiş ədəbiyyat

1. Abbasov Ə. M. (2017). Nitqin sintaktik-semantik strukturu (sadə cümlə üzrə). “Azərbaycan dili və ədəbiyyat tədrisi” elmi-metodik jurnal, № 1, s. 56 – 60.
2. Abbasov Ə. M. (2019). Söz-cümlənin sintaktik-semantik tipləri. Pedaqoji Universitetin xəbərləri, humanitar, ictimai və pedaqoji-psixoloji elmlər seriyası, № 2, s. 12 – 17.
3. Abdullayev Ə. Z. (1960). Müasir Azərbaycan dilində üzvlənməyən cümlələr. Dilçilik məcmuəsi, Nizami adına Ədəbiyyat və Dilçilik İnstitutunun əsərləri, XIV cild, s. 26 – 45.
4. Kazımov Q. (2003). Azərbaycan dilinin tarixi. Bakı, TEAS Press. 678 s.
5. Kazımov Q. (2010). Müasir Azərbaycan dili (sintaksis). IV hissə. Bakı, Elm və təhsil. 497 s.
6. Xəlilov B. (2017). Müasir Azərbaycan dili (sintaksis). Bakı, Adiloğlu. 427 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 34 – 43
doi.org/10.48445/o8447-5018-0019-d



# İmadəddin Nəsiminin dilində işlək olan bəzi şəkilçilərin müasir ədəbi dilimizdə istifadə imkanları

***Rəhilə Hümmətova***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: rahilahummetova@gmail.com
https://orcid.org /0000 -0003-2521-6361

**XÜLASƏ**
Dilimizin uzun əsrlərdən bəri keçib gəldiyi tarixi inkişaf prosesinin öyrənilməsi onun leksik tərkibində və qrammatik quruluşunda baş verən dəyişiklikləri müəyyən etmədən, tədqiq olunan tarixi dövr üçün səciyyəvi olan dil vahidlərinin istər fonetik, istər leksik, istərsə də qrammatik xüsusiyyətlərini linqvistik müstəvidə təhlil süzgəcindən keçirmədən mümkün deyildir. Xüsusilə onun lüğət tərkibini və qrammatik quruluşunu dərindən tədqiq etmək gərəkdir. Çünki dil iki mühüm nəhəngin – lüğət tərkibi və qrammatik quruluşun üzərində dayanır. İmadəddin Nəsimi poeziyasının dili üzərində diaxronik aspektdə aparılan tədqiqatdan məlum olur ki, şairin bədii dilində işlək olan qrammatik şəkilçilərin bəziləri tamamilə arxaikləşmiş, bəziləri fonetik tərkibcə müəyyən dəyişikliyə uğramış, bəziləri isə regional müstəvidə izlərini qoruyub-saxlamışdır (*-ğıl, -gil; -durur, -dürür; -ibani*, *-ıban, -ubanu, -übanü; -alım, -əlim; -cəgin, -cəgiz, -cağız; -ayım, -əyim* və s.).

**AÇAR SÖZLƏR**
İmadəddin Nəsimi, arxaikləşmə, qrammatik formalar, müasir dil baxımından arxaikləşən morfemlər

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 14.10.2024
Qəbul edilib: 27.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO.4, VOL. 282, 34 – 43
doi.org/10.48445/o8447-5018-0019-d

**LINGUISTIC ISSUES**

# Modern Literature of Some Suffixes Used in Imadaddin Nasimi's Language Possibilities of Use in Our Language

***Rahila Hummatova***
Doctor of Philosophy in Philology, Associate Professor, Department of Azerbaijani Language and its Teaching Technology, Azerbaijan State Pedagogical University.
Azerbaijan. E-mail: rahilahummetova@gmail.com
https://orcid.org /0000 -0003-2521-6361

**ABSTRACT**
The study of the historical development process of our language for many centuries is impossible without determining the changes in its lexical composition and grammatical structure, without analyzing the phonetic, lexical, and grammatical features of the language units characteristic for the studied historical period at the linguistic level. In particular, its vocabulary and grammatical structure should be deeply studied. Because the language rests on two important giants − vocabulary and grammatical structure. From the diachronic research on the language of Imadaddin Nasimi's poetry, it is known that some of the grammatical suffixes used in the poet's artistic language are either completely archaic, some have undergone certain changes in their phonetic composition, and some have preserved their traces at the regional level (*-gıl, -gil; -durur, -ibani, -iban, -ubanu; -alım, -elim; -jagin, -jagiz, -jaghiz; -ayim, -eyim*, etc.).

**KEYWORDS**
Imadaddin Nasimi, archaicization, grammatical forms, morphemes that become archaic in terms of modern language

**ARTICLE HISTORY**
Received: 14.10.2024
Accepted: 27.11.2024

## Giriş

Qədim yazılı abidələr, klassik və folklor ədəbiyyatı dilin inkişaf tarixinin tədqiq edilməsində ən etibarlı mənbələrdəndirlər. Bu mənbələr hər bir xalqın ədəbi dilinin qədim və orta çağlarına işıq salır, daha dəqiq desək, linqvistik məlumatlar verməklə düzgün nəticəyə gəlmək imkanı yaradır. Məlumdur ki, ilkin mərhələdə Azərbaycan yazılı ədəbi dili bədii üslub silsiləsində qurulmuş və o dövrün ədəbi dil xüsusiyyətləri İ. Həsənoğlu, Q. Bürhanəddin, İ. Nəsimi, Ş. İ. Xətai, C. Həqiqi, Həbibi, Kişvəri, M. Füzuli və başqalarının əsərlərində tam əhatə olunmuşdur. Linqvistik araşdırma hər bir yazılı mənbənin dili üzərində iş aparmaq, dilin müasir vəziyyəti ilə əlaqədar müqayisələr etmək, dilin hansı səviyyəsində dəyişikliklərin olması və onların yaranma səbəblərini söyləməyə geniş imkan yaradır. Azərbaycan ədəbi dilinin inkişaf tarixində və onun zənginləşməsində xüsusi çəkisi olan İmadəddin Nəsimi poeziyası üzərində apardığımız tədqiqat işi bu baxımdan aktualdır. Şairin poeziyasında müasir dilimiz üçün arxaikləşmiş və ya fonetik tərkibcə dəyişikliyə uğramış qrammatik formalar üstünlüyü ilə diqqət çəkir: *reyhandurur – reyhandır; vədəyi – vədəni; etməgil – etmə; alubanı – alıb; sığmazam – sığmaram; görürmən – görürəm; görücəgiz – görüncə, eyləmənəm – eyləmərəm; olubam – olmuşam; görgəc – görcək, görəndə* və s. Arxaizm hadisəsi dilin bütün sahələrində – həm fonetik sistemində, həm leksik tərkibində, qismən də qrammatik quruluşunda özünü göstərir.

## Əsas hissə

Dildə tarixən müxtəlif qrammatik formalar işlək olsalar da, lakin zaman keçdikcə onlar arxaikləşmiş və ya şəklini dəyişmişdir. İstər folklor ədəbiyyatında, istərsə də klassik yazılı ədəbiyyatımızda yüzlərcə bu cür dil faktlarına rast gəlmək mümkündür: *Göz aç**uban** gördüyüm, könül verib sevdiyim...* (KDQ). *Varın siz ol qurdu istəyün, tutun, dut**ubən** ol qurdu alıb gəlin* (“Qisseyi-Yusif”). *Abdal ol**uban** bəylik edən arifi gör kim, Bu səltənətin qədrini sultan bilir ancaq* (İ. Nəsimi). *Ənbər əfşan saçını küfrə münasib qıl**ıban**, Dürci-yaqutuna mərcan dedilər, gerçəkmiş* (C. Həqiqi). *At**ıban** tutdum səni, Əcəb ovutdum səni. Ömür üzdüm, cəfa çəkdim, Şükür böyütdüm səni* (bayatı).

Orta çağların anadilli poeziyasının ən möhtəşəm söz xəzinəsi sayılan İmadəddin Nəsiminin bədii dili üzərində aparılan linqvistik araşdırmalar nəticəsində bir sıra dil vahidlərinin müasir ədəbi dilimiz baxımından arxaikləşdiyini, bəzilərinin isə fonetik tərkibcə dəyişikliyə uğrayaraq işləndiyini müşahidə edirik. Dilin keçib gəldiyi tarixi inkişaf prosesinin öyrənilməsi onun qrammatik quruluşunda baş verən dəyişiklikləri

müəyyən etmədən, tədqiq olunan tarixi dövr üçün səciyyəvi olan dil vahidlərinin qrammatik xüsusiyyətlərinin linqvistik təhlilini aparmadan mümkün deyildir. Bu dəyişikliklər, arxaikləşmə hadisələri, təbii ki, Nəsimi dilindən də yan keçməyib. İmadəddin Nəsiminin bədii nitqində müasir dil səviyyəsində arxaikləşən, bir sıra fonetik hadisələrlə müşayiət olunaraq istifadə edilən, bir qisminin isə yalnız canlı danışıq dilində işləndiyi ilə bağlı faktlara nəzər salaq:

***-dırır, -dirir, -durur, -dürür* şəkilçi morfemləri**

*Xəti reyhan**dürür** gör kim, göyərmiş kövsər üstünə, Və ya rüxündən ayətdir oxunmuş bədr ilə ayə* [2, s. 61]. *Tuti**dürür** bu şəkkərin dadını, ləzzətin bilən, Qarğa nedir bu gülşəni, zağə şəkər nə faidə?* [2, s. 58] *Şəbi-yelda**durur** saçın gecəsi, Surətin bədrinə qəmər dedilər* [2, s. 278].

Müasir Azərbaycan ədəbi dilində xəbərlik kateqoriyasının III şəxsinin morfoloji göstəricisi *-dır (-dir, -dur, -dür)* morfemidir. Lakin klassik bədii dildə III şəxsin təki, paralel olaraq, həm *-dır, -dir, -dur, -dür,* həm də *-dürür, -durur* şəkilçiləri ilə ifadə olunmuşdur: *Bu Həsənoğlu sənin bəndən**dürür**, Anı rədd etmə, yüzi ağum bənüm! (İzzəddin Həsənoğlu). Qul**durur**, bəlkə, sənə aləmdə hər sultan dəxi (Ş. İ. Xətai). Kim**dürür** aləmdə ol yari-vəfadarım mənim? (C. Həqiqi) Bildi kim, öz aşiqi-zarı**durur**, Həm özünün xəstə bimarı**durur** (Həqiri). Hökm onun hökmü**dürür,** fərman onun fərmanı**dır** (M. Füzuli)* və s.

Əzizxan Tanrıverdi *-dır, -dir, -dur, -dür* xəbərlik şəkilçisinin *durur (turur)* feilindən yarandığını türkoloji araşdırmalara istinad edərək yazırdı: “Türkoloji araşdırmalarda -dır$^4$ şəkilçisinin durur (turur) feili əsasında yarandığı ehtimal edilir” [3, s. 208].

M. Kaşğarinin “Divan”ında bu fikirlər yer almışdır: “Turur: bu müzare feildir, keçmiş zamansız və məsdərsiz işlənir, mənası “odur” deməkdir: “ol taş turur” sözündə olduğu kimi, “o daşdır” deməkdir... Turur: keçmiş zamanı və məsdəri olmayan müstəqbəl bir feildir. Bu söz bir şeyin adı çəkilən anda bir yerdə durduğunu və bulunduğunu bildirir. “Ol əvdə turur” deyilir ki, o, bu an evdədir, evdə var deməkdir. Bu sözlə “ayağa qalxmaq” murad edilmir... (5, II, s. 36, III, s. 177).

Bu şəkilçilər, yəni *-dürür, -durur* şəkilçi morfemi xəbərlik kateqoriyasının arxaik formasıdır və müasir ədəbi dilimizdə fəaliyyətdən qalmışdır. Tarixi qrammatikanın vəzifələrindən biri də məhz bu cür arxaik qrammatik formaların, dil faktlarının araşdırılması, inkişaf tarixinin izlənilməsi, qrammatik formaların dilin passiv fonduna keçməsi səbəblərinin müəyyənləşdirilməsidir.

**Təsirlik hal**

*Səfasız sufi**yi** gör kim, haram der, dinləməz sazı...* [2, s. 45]. *Gərçi hidayət eylədi Musa**yı** narə ol şəcər...* [2, s. 98]. *Xalü xətin Nəsimi**yi** oda buraxdı, yandırır...* [2, s. 98].

Sırf qrammatik hal olan təsirlik hal iş, hal və hərəkətin təsirinə məruz qalan, yəni üzərində iş icra olunan əşyanı bildirir, *kimi, nəyi, haranı, nə* suallarından birinə cavab verir. Əsasən təsirli feil olan cümlələrdə işlənir, yəni təsirli feillərlə idarə olunur. Sintaktik vəzifəsi tamamlıqdır. Təsirlik halın morfoloji əlaməti *-ı, -i, -u, -ü* şəkilçisidir. Müasir ədəbi dilimizdə sonu saitlə bitən isimlərə (adlar qrupuna) təsirlik hal şəkilçisindən əvvəl *"n"* bitişdirici samiti əlavə edilir: *ata+n+ı, bacı+n+ı* və s. "Yazılı abidələrimizdə saitlə bitən isimlər *-ı, -i, -u, -ü* təsirlik hal şəkilçisindən əvvəl təkcə *"n"* yox, həm də *"y"* bitişdiricisini qəbul edir. Daha doğrusu, XVIII əsrə qədər hər iki bitişdiricidən istifadə olunmuşdur. Sonrakı dövrlərdə *"n"* bitişdiricisi ədəbi dil səviyyəsində sabitləşib, *"y"* isə bir bitişdirici kimi məhsuldarlığını itirmişdir" [3, s. 201].

İsmin təsirlik halında saitlə bitən sözlərə *"y"* bitişdiricisinin artırılması "Kitabi-Dədə Qorqud" dastanının dili üçün də səciyyəvi olmuşdur: *"Ac görsə, doyurdu, yalın görsə, donatdı. Borclu**yu** borcundan qurtardı. Yigitləri Qanturalı**yı** öyüb söyləmiş, görəlim, xanım, nə söyləmiş... Tut ol dəli**yi** öldür, səni qoyu verəlim, var, get..."* (KDQ). "...ismin təsirlik halında saitlə bitən sözlərin *-yı* formasını qəbul etməsinə ədəbi dilimizin sonrakı dövrlərində də (XX əsrin əvvəllərində və sovet dövründə, 1920 − 1940-cı illərdə) təsadüf olunur, lakin bu, daha çox ədəbi dildə özünü göstərən meyillərlə bağlı olmuş, ədəbi dilin xəlqi ünsürləri sırasına keçə bilməmişdir" [7, s. 171].

Ancaq bir faktı xatırladaq ki, qərb dialektində, canlı danışıqda, eləcə də aşıq poeziyasında ismin təsirlik halında (saitlə bitən sözlərdə) *"y"* bitişdiricisinin istifadəsi səciyyəvi dil faktlarındandır. Bu cür faktlar bir daha sübut edir ki, ədəbi dilin tarixi inkişaf yolunu izləmək üçün ən etibarlı mənbələrdən biri dialektlərdir: *Düzləri budayar dövrün çəliyi, Sevər yalançı**yı**, sevər dəli**yi**...* (A. Azaflı) Göründüyü kimi, substantiv *"yalançı"* və *"dəli"* leksik vahidləri ismin təsirlik halının morfoloji əlaməti ilə işlənmişdir. Lakin ədəbi dilin orfoqrafik normalarına uyğun olaraq, bu sözlər *"n"* bitişdirici samitini deyil, *"y"* bitişdirici samitini qəbul etmişdir. Ə. Dəmirçizadə yazırdı: "Saitlə bitən isimlərə təsirlik hal şəkilçisi bitişdirildikdə lap əvvəllərdən köklə şəkilçi arasında bitişdirici *"y"* səsi işlənilmişdir (*ata+y+ı, dədə+y+i, Leyli+y+i*), lakin sonralar bəzən *"y"* əvəzinə *"n"* işlənilmiş və beləliklə, burada da *y\\n* müvaziliyi hətta XIX əsrə qədər davam etmişdirsə də, XVIII əsrdə *"n"* üstünlük kəsb etmiş və əsas norma kimi sabitləşmişdir. Qazax şivəsində indi də *"y"* işlənir..." [4, s. 262].

Müasir ədəbi dilimizdə *"nəyi"* və *"suyu"* sözlərində *"y"* bitişdirici samiti qalmaqdadır.

**Feilin əmr şəklinin morfoloji əlamətləri. I şəxsin cəmi (-*alım*, -*əlim*)**

*Vədəyi qoy, ey könül, gəl bu dəmi xoş gör**əlim**, Dün də keçdi, danla qaib, bəs bu dəm xoş dəmdürür.* Bu beytdə maraq doğuran və müasir ədəbi dilimiz üçün arxaikləşən morfoloji əlamətlərdən biri "görəlim" feilindəki -*əlim* şəkilçi morfemidir. Bu şəkilçi feilin əmr şəklinin I şəxsinin cəm şəkilçisidir. "Kitabi-Dədə Qorqud"un dili üçün də səciyyəvi morfoloji göstəricilərdəndir: "*Mərə çoban! Baş endirib bağır basgil. Bizə salam vergil. Öldürmə**yəlim**, Şöklü Məliyə səni ilət**əlim**, sənə bəylik alı ver**əlim** – dedilər... Gəlin var**alım**, – dedi, – tut**alım**..."* [1, s. 42].

Müasir Türkiyə türkcəsində -*alım,* -*əlim* I şəxsin cəminin şəkilçisi kimi aktivdir: *Gel gök yüzünde yıldız ol**alım**, Gel seninle yarınlara koş**alım.*** Şivələrimizin bir çoxunda, xüsusən Bakı şivəsində feilin əmr şəklinin I şəxsinin cəmi -*əyin, -ağın, -ağun, -əgün,* -*egün* fonetik tərkiblərdə işlənməkdədir (gedəyün, alağun, oynuyağın və s.).

**II şəxsin təki (-*gil, -ğıl, -gilən*)**

*Dərd ilə sən Nəsiminin gövhərini gəl alma**ğıl**, Aşiq olan kişilərə eşqə sipər nə faidə? Arif isən, dünyayı sevmə**gilən** at orduna* [2, s. 58]. Onu da qeyd edək ki, Nəsiminin dilində feilin əmr şəklinin II şəxsinin təki həm -*gil,* -*gilən,* -*ğıl* şəkilçiləri ilə, həm də müasir ədəbi dilimizdə olduğu kimi, yəni şəkilçisiz işlənmişdir: *Görmə* rəva bu halımı, *qoyma* bu rəsmi karə *gəl* [2, s. 130]. *Fəzli-ilahə canını **eylə** fəda, Nəsimi, sən, **Olma** məlul, **ayıtma** kim, bəndü həsar içindəyəm* [2, s. 154]. *Sən bu nişanla **bil** məni, **bil** ki, nişanə sığmazam* [2, s. 168]. Bu şəkilçilər (-*ğıl,* -*gil*) yazılı abidələrimizin dilində məhsuldarlığı ilə seçilir. Göytürk yazılı abidələrinin dilində -*ğıl,* -*gil* şəklində işlənərək əmri qüvvətləndirməyə xidmət göstərildiyini bildirən Ə. Şükürlü yazır: "Elmi ədəbiyyatlarda əmr şəkilçisi kimi izah olunan -*ğıl,* -*gil,* əslində, sözün kökü ilə ifadə olunan əmrlik məfhumunu qüvvətləndirmək vəzifəsini yerinə yetirir: *sabımın tükəti eşit**gil** nitqimi axıradək dinləyin; karağu... ur**ğıl** qarovulçu qoy"* [8, s. 125].

Azərbaycan ədəbi dilinin tarixi inkişaf yoluna nəzər salsaq, həmin şəkilçi morfemlərin -*ğıl,* -*gil,* -*ginən,* -*gilən* formalarında "Kitabi-Dədə Qorqud" dastanında, klassik şairlərimizin – İ. Həsənoğlu, Q. Bürhanəddin, Ş. İ. Xətai və başqalarının dilində geniş şəkildə işləndiyinin şahidi olarıq: *Sən ona var**ğıl**, iki oğlancığı öksiz qoma**ğıl**. Qonur atın ver**gil** mana! Altmış tutam göndərini ver**gil** mana! Qarıcıq olmuş ananı bozaltma**ğıl**... Qoyma**gil** qəsd edə bu məlun bana* ("Vərqa və Gülşah"). *Sözünü yaxşı bişir**gil**, Yaxşı us ilə düşür**gil**, Yaramazını şaşır**gil**!* (Ş. İ. Xətai)

Müasir Azərbaycan ədəbi dilində feilin əmr şəklinin II şəxsin təkinin şəkilçisi kimi fəaliyyət göstərməsə də, şərq qrupu dialektində -*ginən,* -*gınan,* qərb qrupu dialekt və şivələrində isə -*ynan,* -*ynən,* -*ginən,* -*ginan* formasında tələffüzü aktiv mövqedədir.

**Nəqli keçmiş zamanın morfoloji göstəricisi – *-ıb* + *-am***

*Kəpənək geymişəm, əndişədən azad ol**ubam,** Üşümək müşkilini eylədi asan kəpənək* [2, s. 124]. Beytin mənası belədir: "Yapıncı (*kəpənək* qədim türk sözüdür, burada sufilərin geyindiyi xirqə nəzərdə tutulur) geyinmişəm, qayğıdan azad olmuşam, Yapıncı üşüməkdən də məni azad etdi, qurtardı". Onu qeyd edək ki, nəqli keçmiş zaman əvvəlcə icra olunmuş bir iş haqqında xəbər verilən zaman şahidlik vermədən, müşahidəçi olmadan, yalnız işin, hal və hərəkətin icrasının nəticəsini bildirən zaman arasındakı vaxtdır. Yəni iş əvvəlcə icra olunur, sonra heç bir şahidlik olmadan həmin işin icrası nəql olunur. Nəqli keçmiş zaman *-mış, -miş, -muş, -müş; -ıb, -ib, -ub, -üb* şəkilçisi ilə formalaşır: *almışam, almışıq, alıbsan, alıbsınız* və s. O da məlumdur ki, *-ıb, -ib, -ub, -üb* şəkilçisi müasir ədəbi dilimizdə I şəxsdə olan feillərə artırılmır. Lakin ədəbi dilin inkişaf prosesinin izlənməsi bu şəkilçinin I şəxsin təkinə də artırıldığını deməyə əsas verir. "XV − XVII əsrlər Azərbaycan yazılı abidələrinin dilində nəqli keçmiş zamanın *-ub, -üb + (-am, -əm) = -ubam, -übəm,* həm də *-ıb (mən), -ub (mən)* şəklində ifadə olunmasına rast gəlinir: Eşq daminə giriftar olalı zar ***olubam,*** Nə bəladır ki, ona böylə giriftar ***olubam*** (Füzuli)..." [3, s. 299].

Nəsimi poeziyasının dili üzərində aparılmış linqvistik araşdırma *-ıb + (-am) = -ıbam* şəkilçisinin I şəxsin təki ilə də işləndiyini və beləliklə, müəllifin gəldiyi qənaətin daha əvvəlki əsrlərdən başlamağın lazım olduğu fikrini deməyə əsas yaradır.

**Feilin qeyri-qəti gələcək zamanının inkarı. I şəxsin təkində *z − n* samitlərinin istifadəsi**

*Gerçək olmaz əgridil, inanma**z**am iqrarinə; Mən aşiq oldum, girmə**z**əm hər qissəxanın pəndinə* [2, s. 52, 71]. Qeyd edək ki, müasir Azərbaycan ədəbi dilində feilin xəbər formasının qeyri-qəti gələcək zamanın inkarında II və III şəxsin həm təkində, həm də cəmində "*r − z*" əvəzlənməsi baş verir (təkində: *mən getmərəm, sən getməzsən, o getməz;* cəmində: *biz getmərik, siz getməzsiniz, onlar getməzlər*). İmadəddin Nəsiminin dilində feilin qeyri-qəti gələcək zamanının inkarında şəxslərə görə dəyişməsi müasir ədəbi dilimizdə olduğu kimidir. Lakin nümunələrdən də göründüyü kimi, feilin qeyri-qəti gələcək zamanının inkarında I şəxs "*-maz, -məz"* şəklində işlənmişdir. Şairin dilində müasir dildən fərqli yalnız "*r − z*" əvəzlənməsi deyil, I şəxsdə (qeyri-qəti gələcək zamanın inkarında) *"-man, -mən, -məm*" ilə işlənmə faktları da müşahidə edilir: *Fəraqın dərdi çoxdur, deyə **bilmən**, Əgər desəm, qalır heyran cəvanım. Qatımdan getməz oldu nari-hicran, Çəkə **bilməm**, nedim, arami-canım* [2, s. 146]. Ə. Tanrıverdi *mən* əvəzliyinin şəkilçiləşməsi prosesində I şəxsin təkini ifadə etmək üçün "*m*" ilə yanaşı, "*n*" şəkilçisindən də istifadə olunduğunu yazır və H. Rəcəbliyə istinad edir [3, s. 302]. Nümunələrdən də aydın olduğu kimi, hər iki halda

hərəkətin təsdiqindən yox (həm indiki, həm də qeyri-qəti gələcək zaman kimi düşünülə bilinən hərəkət), inkarından söhbət gedir: *Fəraqın dərdi çoxdur, deyə* ***bilmərəm (bilmirəm)****, əgər desəm, cavanım heyran qalar.* Bu da məlumdur ki, şəxs şəkilçilərinin əksəriyyətinin əsasını şəxs əvəzlikləri təşkil edir. Feilin qeyri-qəti gələcək zamanının inkarının *-maz, -məz; man, -mən* şəkilçiləri ilə işlənməsi faktları XIX əsrə qədərki Azərbaycan yazılı abidələrinin dili baxımından səciyyəvidir. Hətta qərb qrupu şivələrində işləkliyini XX əsrin sonlarına qədər mühafizə etmişdir.

Yeri gəlmişkən, İ. Nəsiminin dilində feilin indiki zamanı sonu saitlə bitən feillərdə ***-r*** şəkilçisi ilə işlənir: *Gərçi asandır de**r**, ey can, eşqini hər bixəbər, Kim ki, şol sevdayə düşdü, bildi kim, asan degil. Ey ki, sultan olmaq istə**r**sən, fəqir ol kim, yəqin, Kim ki, sultan oldu, dərviş olmadı, sultan degil* [2, s. 138]. Bu cür faktlar "Kitabi-Dədə Qorqud"un, klassik yazılı abidələrimizin, aşıq poeziyasının dili üçün də səciyyəvidir: *Nə bozla**r**san, nə ağla**r**san? Bağrımla yürəyim nə dağla**r**san?* (KDQ) *Nə ağla**r**san, nə sızla**r**san, Bir dərdi beş olan könlüm...* (A. Tufarqanlı). *Sevən ölsünmü, sultanım, nə de**r**sən?* (Ş. İ. Xətai) Şivələrimizdə də indiki zaman şəkilçisində saitin düşməsi faktı müşahidə edilir*: Anam de**:r**, bizə gəlsin* (Tovuz, Qazax, Gədəbəy).

**Feili bağlama şəkilçiləri: *-ıban, -ubani***

*Daş al**ubani** dilbər, könlüm şişəsin atar, Qarşu tutaram, şişə bilməm qala, ya sinə; Mənsuri-eşq ol**ub** verir isə Nəsimi can, Anın muyini ayəti "nimən-nəsir" ola; Şeyda qıl**ıban** saldı məni cümlə cahanə* [2, s. 46, 35, 69].

Feili bağlama feilin təsriflənməyən formalarından biri olub, özündən sonra gələn müəyyən bir feillə əlaqəyə girir və həmin feildə ifadə olunan iş, hal-hərəkətin tərzini, səbəbini, zamanını və s. bildirir. Müasir türk dillərində müxtəlif fonetik variantlarda 70-ə qədər feili bağlama şəkilçisi mövcuddur. Bunlardan bir çoxu qədim türk yazılı abidələrində işlənilmişdir. Azərbaycan dilində bu şəkilçilərin əksəriyyəti eyni ilə, bəziləri isə cüzi fonetik dəyişikliklərə uğramaqla işlənir: *-ıb (-ib, -ub, -üb); -a (-ə); -araq (-ərək); -dıqca (-dikcə, -duqca, -dükcə); -madan (-mədən); -arkən (-ərkən); -mışkən (-mişkən, -muşkən, -müşkən); -alı (-əli); -caq (-cək); -ar, -maz (-ər, -məz)* və s. Feili bağlama şəkilçilərinin işləklik dairəsi müxtəlifdir. Belə ki, *-ıb*$^{4}$, *-dıqca*$^{4}$, *-anda*$^{2}$, *-arkən*$^{2}$, *-araq*$^{2}$... şəkilçiləri öz işləkliyinə görə digər feili bağlama şəkilçilərindən seçilir, -*alı* (-*əli*) şəkilçisi isə arxaikləşməyə doğru gedir. -*ıb, -ib, -ub, -üb* feili bağlama şəkilçisi yazılı abidələrin dilində, eləcə də tədqiqat apardığımız Nəsiminin bədii dilində həm -*ıb, -ib, -ub, -üb,* həm də -*ıban, -ibən, -uban, übən\\ibanu\\übənü\\ubanu* formasında müşahidə edilir: *Alar sabah Dirsə xan qalx**ıbanı** yerindən uru durub qırx yigidin boyuna al**ıb** Bayındır xanın söhbətinə gəlirdi... Varcaq gəl**übəni** məni qarşıladılar, ilət**übəni** qara otağa qondurdular...Göz aç**ıban** gördügüm, Könül ver**ib** sevdiyim,a Dir-*

*sə xan* [1, s. 29, 34].

Həmin şəkilçilərin (*-ıb, -ib, -ub, -üb*) qədim Göytürk yazılarında *-ıp, -ip, -p* formasında, uyğur kitabələrində *-ıp, -ip, up, -üp; -ap, -əp, -p* fonetik tərkibdə işləndiyi müşahidə edilir: "*Ol bəg balık bəgi bol**up** ertə kəd ölütçi boltı* (Şəhər hökmdarı olan o bəy əvvəlcə qatil oldu...). *Bunça bodın kəl**ipən** sığtamıs* (Bu qədər xalq gələrək ağlamış...). ***Olurıpan** türk bodunın ilin, törisin tuta birmis* (Xan olmaqla türk xalqının el birliyini, hakimiyyətini qoruyub-saxlamış...). *-ıpan, -ipən* şəkilçisi Azərbaycan türk dilində *-ban, -ibən, -uban* şəklində qorunub-saxlanılmışdır" [8, s. 137 – 138].

Feili bağlama şəkilçisinin qədim formasından olan "*-uban, -übən*"nin *-ıb, -ib* şəkilçisinə nisbətən qədim olduğu mühakiməsinə münasibət bildirən V. Əliyev yazırdı: "*-uban, -übən; ubanı, -übəni* formalarının yazılı abidələrdə qeydə alınması, türk dillərinin dialektlərində bu gün belə işlənməsi, daha çox canlı danışıq dilinə məxsus olması, şəkilçilərdə sabitləşmənin mürəkkəbdən sadəyə doğru inkişafı bu formalarda inkişafın belə bir istiqamətdə getdiyini düşünməyə əsas verir: *-ıpanı, -ipəni, -upanı, -üpeni / - panı, -peni, -ıpan, -ipen, -upan, -üpen / -pan, -pen / -ıp, -ip, -up,-üp / -p, -ıb*" [6, s. 53].

İ. Nəsiminin poetik nitqində müasir dil baxımından arxaikləşən, fonetik tərkibcə dəyişikliyə uğrayan digər feili bağlama şəkilçiləri də üstün işlənmə tezliyinə malikdir. Bunlara *-(i)cəgiz, -cəgin, -(i)cək, -(ı)caq, -(ı)cağız* feili bağlama şəkilçilərini nümunə göstərmək olar: *Nəsiminin sininə gəl, qəmindən ölə**cəgin**, Xoş amədi eşit, ey dost, mərhəbasindən* [2, s. 196]. *Sədəfin gərçi dəhani doludur incu ilə, Aç**ıcaq** ləblərini löleyi-lala tökülür* [2, s. 299]. *Ruhunu Mustafanın an**ıcağız**, Ver salatı ki, şərtü adətdir* [2, s. 316]. *Ay ilə gün sücud edər surətini gör**icəgiz**, Bu nə camalü hüsn olur səlli-əla cəmalinə* [2, s. 80]. *Yarəm deyici çoxdurur, amma bəhəqiqət, Fürsət gəl**icək** yari-vəfadar bulunmaz* [2, s. 81].

Nümunələrdən göründüyü kimi, İmadəddin Nəsiminin bədii dilində müasir ədəbi dilimizdə işlənən qrammatik formalardan müəyyən qədər fərqlənən, bəzən də müasir dil baxımından arxaikləşən şəkilçi morfemlər müşahidə olunmaqdadır. Bu cür faktların araşdırılması orta çağların dil xüsusiyyətlərini müəyyənləşdirmək imkanı yaradır.

**Nəticə**

İ. Nəsiminin bədii nitqində müasir ədəbi dilimizin qrammatik sistemindən müəyyən qədər fərqlənən, hətta ümumdil üçün köhnəlmiş qrammatik formalar da müşahidə edilir. Qrammatik formaların müasir dil baxımından arxaikləşməsi dilin özünün daxili qanunauyğunluğu ilə bağlıdır. Zaman keçdikcə dildə arxaikləşən qrammatik şəkilçilərə qismən sinonim olanlar əvvəlkiləri sıxışdırıb aradan çıxarır, bəzilərində isə fonetik də-

yişmələr, səsartımı, səsdüşümü və s. hadisələr baş verərək istifadə olunur. İ. Nəsiminin dilində müşahidə edilən *-durur, -dürür* xəbərlik, *-gil, -ğıl; -alım, -əlim* feilin əmr şəklinin II şəxsinin təki və I şəxsinin cəminin şəkilçiləri; *-ıban*$^{4}$*, -cağız*$^{2}$*, -gəc* və s. kimi feili bağlama şəkilçilərilərinin bir qismi şivələrdə, canlı danışıq dilində, bir qismi isə müasir ədəbi dildə müəyyən fonetik dəyişikliklərlə işləkliyini davam etdirir.

**İstifadə edilmiş ədəbiyyat**


1. Azərbaycan ədəbiyyatı inciləri. (1987). Bakı, Yazıçı. 571 s.
2. İmadəddin N. (1991). Mən bu cahana sığmazam. Seçilmiş əsərləri. Bakı, Gənclik.
3. Tanrıverdi Ə. (2010). Azərbaycan dilinin tarixi qrammatikası. Bakı, Elm və təhsil. 458 s.
4. Dəmirçizadə Ə. (2007). Müasir Azərbaycan dili. I hissə. Bakı, Şərq-Qərb. 251 s.
5. Kaşğari M. (2006). “Divanü lüğat-it türk”. Bakı, Ozan, 387 s.
6. Əliyev V. (1989). Azərbaycan dilində feili bağlama. Bakı, Elm. 113 s.
7. Əzizov E. (1999). Azərbaycan dilinin tarixi dialektologiyası. Bakı, “Bakı Universiteti” nəşriyyatı, 351 s.
8. Şükürlü Ə. (1993). Qədim türk yazılı abidələrinin dili. Bakı, Maarif. 336 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 44 – 49
doi.org/10.48445/s1816-9849-7269-s



# Vaqif Qurbanovun elmi yaradıcılığında linqvodidaktik etüdlər

***Elşad Abışov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Müasir Azərbaycan dili kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: elsad_abisov@mail.ru
https://orcid.org/0000-0002-5048-1872

**XÜLASƏ**
Məqalədə filologiya elmləri doktoru, professor Vaqif Tapdıq oğlu Qurbanovun elmi fəaliyyətindən bəhs olunur. Alimin yaradıcılığı üzərində aparılan təhlillərdən məlum olur ki, onun Azərbaycan dilçiliyinin ayrı-ayrı sahələrinə (əsasən də metodika sahəsinə) həsr olunmuş əsərlərində dilçiliyimizin bir sıra mübahisə doğuran ziddiyyətli məsələlərinə aydınlıq gətirilir, ali və orta məktəblərdə təhsil alan gənc nəslə ana dilinin daha səmərəli və effektiv mənimsənilməsi qaydaları, bu qaydaların vasitə və üsulları mövcud elmi prinsiplər əsasında şərh edilir. Qavranılma prosesində fəndaxili əlaqələrin effektivliyi xüsusi olaraq diqqətə çatdırılır.

**AÇAR SÖZLƏR**
liqvistika, metodika, sintaksis, didaktika, norma

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 21.09.2024
Qəbul edilib: 08.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 44 – 49
doi.org/10.48445/s1816-9849-7269-s

**L I N G U I S T I C   I S S U E S**

# Linguodiactic Etudes in the Scientific Work of Vagif Gurbanov

***Elshad Abishov***
Doctor of Philosophy in Philology, Associate Professor, Department of Modern Azerbaijani Language, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: elsad_abisov@mail.ru
https://orcid.org/0000-0002-5048-1872

**ABSTRACT**
The article talks about the scientific activity of Doctor of Philological Sciences, Professor Vagif Tapdig oghlu Gurbanov. From the analysis of the scientist's work, it is known that his works dedicated to different fields of Azerbaijani linguistics (mainly the field of methodology) shed light on a number of controversial issues of Azerbaijani linguistics, and the young generation studying in higher and secondary schools are more efficient and effective in their mother tongue. the rules of assimilation, the means and methods of these rules are interpreted on the basis of existing scientific principles. In the process of perception, the effectiveness of intra-fan relationships is especially emphasized.

**KEYWORDS**
linguistics, methodics, syntax, didactics, norms

**ARTICLE HISTORY**
Received: 21.09.2024
Accepted: 08.11.2024

## Giriş

Azərbaycan xalqı bəşər tarixinə zaman-zaman görkəmli şəxsiyyətlər, xüsusi istedada malik böyük simalar bəxş etmişdir. Fəaliyyətinin, demək olar ki, əsas hissəsini toplumun maariflənməsinə və bütövlükdə inkişafına yönəldən bu şəxsiyyətlər elmi əsaslara söykənən milli-ideoloji strategiyalar müəyyənləşdirməklə müasir dünya ilə ayaqlaşan intellektual cəmiyyətin qurulmasına önəmli töhvələr vermişlər. Məhz bunun nəticəsidir ki, qısa zaman kəsiyində təhsildə və elmin müxtəlif sahələrində böyük məsafələr qət edən respublikamız qloballaşan dünyanın müasir və innovativ ölkələri sırasında önəmli yer tutmuşdur.

## Əsas hissə

Ziyası ilə millətin gələcəyinə işıq saçan, həyatının 60 ilə yaxın bir dövrünü gənc nəslin təlim-tərbiyəsinə, elmi biliklərə yiyələnməsinə və pedaqogika elminin inkişafına həsr edən alimlərdən biri də pedaqogika üzrə elmlər doktoru, professor Vaqif Tapdıq oğlu Qurbanovdur.

Professor V. T. Qurbanovun elmi fəaliyyətini üç istiqamətdə qruplaşdırmaq olar:

1) nitq mədəniyyəti və natiqlik sənəti,
2) müasir Azərbaycan dili məsələləri,
3) Azərbaycan dilinin tədrisi və onun bəzi aktual problemləri.

Alimin nitq mədəniyyəti ilə bağlı nəzəri mülahizələri onun "Azərbaycan dili və nitq mədəniyyətinin əsasları" (Bakı, 2008) adlı dərs vəsaitində öz əksini tapmışdır.

Uzunmüddətli pedaqoji təcrübənin, fasiləsiz araşdırma və müşahidələrin məhsulu kimi ərsəyə gələn bu əsər "Mədəni nitq ədəbi dilin normalarına əsaslanır", "Nitq mədəniyyəti normaları", "Natiqlik kursları", "Müəllim nitqinə dair etüdlər" adlı fəsillərdən, "Əlavə mətnlər, dürəfşan kəlmələr", "Nəticə", "Planlaşdırma" və "Ədəbiyyat siyahısı"ndan ibarətdir.

Məlum olduğu kimi, son dövrlərədək nəşr olunmuş bəzi dərslik və dərs vəsaitlərinin bir çoxunda "Nitq mədəniyyəti"nin predmetsiz bir elm sahəsi olması ilə bağlı fikirlərə geniş yer verilirdi. Bəzi tədqiqatçılar bunu əsas götürərək "Nitq mədəniyyəti"ni elm adlandırmağın məqsədəuyğun olmadığı qənaətinə gəlmişdilər.

Fikrimizcə, yanlış nəticələrə yol açan belə dolaşıq tezislərin başlıca səbəblərindən biri "Nitq mədəniyyəti"nin, daha konkret desək, insan nitqinin çoxşaxəli və ya çoxpredmetli olmasından qaynaqlanır.

Dərs vəsaitinin I fəslində elmi əsası olmayan bu tip problemlərə aydınlıq gətirən V.Qurbanov faktlarla sübut edir ki, "Nitq mədəniyyəti"nin obyekti dilin normalarına əsaslanan canlı danışıq aktı, predmeti isə nitqin ayrı-ayrı sahələridir [2, s. 8 – 10].

Burada həmçinin dil və nitq, onların oxşar və fərqli xüsusiyyətləri, ədəbi dilin normaları, nitq etiketləri və natiqlik sənəti haqqında sistemli məlumat verilir, ədəbi dilin normaları əsasında təşəkkül tapan mədəni nitqə verilən tələblər, onların spesifikası şərh olunur [2, s. 13 – 62].

Əsərin "Natiqlik kursları" adlı III fəslində görkəmli Azərbaycan natiqləri Nizami Gəncəvi, M. Füzuli, həmçinin M. P. Vaqif, M. Ə. Sabir, H. Cavid, S. Vurğun və XX əsrin sonu, XXI əsrin əvvəllərində dünyanın siyasi mənzərəsində və Azərbaycan siyasi mühitində özünəməxsus yeri olan ümummilli lider H. Əliyevin natiqlik sənəti və nitq mədəniyyəti haqqındakı fikirlərinə geniş yer verilir [2, s. 98 – 134].

Müəllif burada sadəcə nitq mədəniyyəti ilə bağlı elmi-nəzəri mülahizələrin təqdim edilməsi ilə kifayətlənmir, əsərin "Müəllim nitqinə dair etüdlər" bölməsində ustad dərsində müəllimin nitqinə verilən tələblər, dərsin aparılma qaydası, natiqlik sənətində humanizm meyillərinin gücləndirilməsi, praktik nitqin incəliklərinə yiyələnmək məqsədilə qiraət dərsləri üzrə işin optimal imkanlarının müəyyənləşdirilməsi və səmərəli müəllim seçiminə natiq münasibəti kimi aktuallığı ilə diqqəti cəlb edən vacib elmi-metodik məsələlərin analizinə geniş yer verilir, Azərbaycan dili və dilçiliyində özünü göstərən uğurlar və müşahidə olunan çatışmazlıqlar linqvodidaktik aspektdə təhlil predmetinə çevrilir [2, s. 98 – 136].

Professor V. T. Qurbanovun elmi-tədqiqat istiqamətlərindən birini də "Azərbaycan dili təliminin bəzi problem məsələləri" təşkil edir. Onun bu sahə ilə bağlı fikirlərinin əks olunduğu eyniadlı əsərində "Söz yaradıcılığının tədrisi problemləri" , "Azərbaycan dilinin tədrisi" və "Azərbaycan dili tədrisinin aktual problemləri"ni əhatə edən önəmli elmi-metodik yanaşmalar yer alır. Bu yanaşmalar alimin müəllimlərin təkmilləşmə kursunda apardığı müşahidələrinə əsaslanır [4, s. 3 – 18].

Əsərdə, dilçiliyin digər sahələrindən fərqli olaraq, dildaxili əlaqədə tədris olunan söz yaradıcılığının V – XI siniflərdə mənimsədilməsində nəzərəçarpan çatışmazlıqlar və sözyaratma prosesində həllini gözləyən problemli məsələlərin mahiyyətinə ardıcıllıqla aydınlıq gətirilir, onların həlli yolları göstərilir, tərkibində alınma şəkilçilərin iştirak etdiyi sözlərin, həmçinin söz kökü və söz əsasının daha effektiv qavranılması üçün müxtəlif məzmunlu praktik çalışmalar verilir [4, s. 37 – 80].

Alim şəkilçilərin dildə rolu və işlənmə xüsusiyyətləri haqqında fikirlərini davam etdirərək araşdırmanın "Azərbaycan dilinin tədrisi metodikası" bölməsində orta məktəb Azərbaycan dili dərslərinin tədrisində qarşıda duran çətinliklər və vəzifələrdən söz açdıqdan sonra budaq morfemlərin orfoepik normalara uyğun tələffüzünün metodoloji səciyyəsini aydınlaşdırır, Azərbaycan dili təliminin aktual problemləri barədə rəy və təkliflərini qeyd edir. Tədqiqatçının bu problemlə bağlı fundamental araşdırmaları onun

2009-cu ildə çap olunmuş "Azərbaycan dili təliminin aktual problemləri" mövzusunda yazdığı dərs vəsaitində daha geniş planda öz həllini tapır. Əsərdə, müəllifin qeyd etdiyi kimi, Azərbaycan dili təlimi üçün problem hesab olunan iki böyük məsələdən bəhs olunur:

a) fəndaxili əlaqə prinsipinə lazimi dərəcədə və ya həcmdə əməl olunmaması;
b) morfologiya tədrisinin praktik istiqamətinin gücləndirilməsi sisteminə daxil olan və ya bu geniş iş sisteminin bir mühüm aspektini, yaxud da tərkib hissəsini təşkil edən ədəbi tələffüz vərdişlərinin inkişaf etdirilməsinə diqqətin yönəldilməsi [4, s. 5].

Dilin sistem xarakteri XIX əsrdən elmə məlum olsa da, onun ana dilinə tətbiqi diqqətdən kənarda qalmışdır. V. Qurbanov əldə etdiyi nəzəri məlumatlar əsasında haqqında söhbət açdığımız dərs vəsaitində, ilk dəfə olaraq, fənlər arasında olduğu kimi, fəndaxili əlaqənin də mövcudluğu konsepsiyasını irəli sürür və ana dilinin bu kontekstdə öyrənilməsinin zəruriliyini ortaya qoyur. O, apardığı təhlillərdə fəlsəfi xarakter daşıyan dil sistemi və həmin sistemi təmin edən fəndaxili inteqrasiya problemini ana dili təliminə peşəkarlıqla tətbiq etməklə səsdən cümləyə və oradan da mətnlərə inkişaf yolu keçən dil vahidlərinin əlaqəli şəkildə öyrənilməsinin daha səmərəli olduğunu faktiki dil materialları ilə izah edir, Azərbaycan dili dərslərində fəndaxili əlaqədən səmərəli istifadə metodlarını göstərir. Araşdırma prosesində dilin morfoloji və sintaktik səviyyələrində fəndaxili əlaqəlilik dəqiq tətbiq olunur, bu əsasda morfoloji və sintaktik vahidlərin qarşılıqlı əlaqəsi zəminində təzahür edən linqvistik hadisələr araşdırma obyektinə çevrilir [4, s. 24].

Professor V. T. Qurbanovun tədqiqat sferasında mühüm yer tutan elmi əsərlərindən biri də "Azərbaycan dilinin tədrisi metodikası" (Bakı, 2014) adlı monoqrafiyadır. Azərbaycan dili təliminin bir çox sahələrinə aydınlıq gətirən bu əsərin "Azərbaycan dili təliminin metodologiyası" adlanan II fəslində fəndaxili əlaqənin linqvostruktur xəritəsi verilir, fonetika və söz yaradıcılığı təliminin didaktikası üzrə optimal imkan və yollar araşdırılır, morfologiya və sintaksisin tədrisi prosesində müşahidə olunan problemlərin mahiyyətinə aydınlıq gətirilir və bu əsasda dilin qrammatik sisteminin tədrisi yollarının elmi əsasları müəyyən edilir.

Kitabın "Linqvistik təhlilin metodologiyası" adlanan IV fəslində dilçilikdə bir çox hallarda mübahisə predmetinə çevrilən sintaktik təhlilin mahiyyəti və xarakterik xüsusiyyətləri şərh olunur, fonetik, leksik, morfoloji və sintaktik təhlilin nəzəri və praktik xüsusiyyətləri haqqında geniş məlumat verilir [3, s. 58 – 193].

Hər bir dilin mənsub olduğu xalqın milli sərvətinin, milli kimliyinin əsas göstəricisi olduğunu, buna görə də ana dilimizin inkişafına diqqət və qayğının zəruriliyini təəssübkeşlik hissi ilə dərk edən professorun bütün elmi fəaliyyətini obrazlı şəkildə ifa-

də etmiş olsaq, onun bu istiqamətə kökləndiyini görərik. Haqqında söhbət açdığımız tədqiqatları və 2023-cü ildə ADPU-nun Elmi Şurasının qərarı ilə çap etdirdiyi "Azərbaycan dili təliminin aktual problemləri" adlı irihəcmli əsəri bunun bariz nümunəsidir.

Azərbaycan dilinin tədrisi prosesində müşahidə olunan çatışmazlıqlar və dil təliminə, kurikuluma əsaslanan yeni yanaşmaların əks olunduğu bu monoqrafiya yeddi fəsildən ibarətdir. Əsərdə kurikulum metodologiyası üzrə Azərbaycan dili təliminin müasir tələblərinə geniş yer verilir; ilk dəfə olaraq burada linqvodidaktika və linqvometodikanın yeni aspektlərinə dair mülahizələr əks olunur. Bundan əlavə, araşdırmada ədəbi dil və mədəni nitqin normalarının mənimsədilməsi yolları, onların həllinə dair innovativ yanaşmalar və səmərəli metodlar təklif olunur.

Nitq və təfəkkürün inkişafı, oxu və yazının məzmun xətləri üzrə didaktik məqsədlər, təlim nəticələri, standartlar və məzmun xətləri arasında inteqrasiya məsələlərinin şərhi, həmçinin ədəbi tələffüz vərdişlərinin aşılanmasının imkan və yollarına dair elmi-metodiki müddəaların irəli sürülməsi də monoqrafiyanın elmi-metodiki dəyərini artıran konseptual yanaşma kimi ortaya çıxır.

**Nəticə**

Professor Vaqif Tapdıq oğlu Qurbanovun elmi yaradıcılığı üzərində aparılan təhlillər bir daha göstərir ki, Azərbaycan dilçiliyinin həm nəzəri, həm də metodiki sahələrində problemlər hələ də müşahidə olunmaqdadır. Onların bir qismi alimin elmi yanaşmalarında həllini tapsa da, müəyyən bir hissəsi isə hələ də həll olunmamış qalır. Bu da, öz növbəsində, Azərbaycan dilçiliyi ilə bağlı yazılmış tədqiqat əsərlərinin sistemli şəkildə yenidən nəzərdən keçirilməsinin zəruriliyini ortaya qoyur.

**İstifadə edilmiş ədəbiyyat**

1. Qurbanov V. (2008). Azərbaycan dilinin tədrisinin bəzi aktual problemləri. Bakı, "Müəllim" nəşriyyatı. 56 s.
2. Qurbanov V., Əmirli A. (2009). Azərbaycan dili tədrisinin aktual problemləri. Bakı, "Müəllim" nəşriyyatı. 162 s.
3. Qurbanov V. (2014). Azərbaycan dilinin tədrisi metodikası. Bakı, "Müəllim" nəşriyyatı. 258 s.
4. Qurbanov V., Xalıqov F., Abbasova S. (2018). Azərbaycan dili və nitq mədəniyyətinin əsasları. Bakı, "Müəllim" nəşriyyatı. 185 s.
5. Qurbanov V. (2023). Azərbaycan dili təliminin aktual problemləri. Bakı, "Müəllim" nəşriyyatı. 264 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 50 – 57
doi.org/10.48445/r8993-3735-4428-y

DİLÇİLİK MƏSƏLƏLƏRİ

# Publisistik üslubda olan hərbi mətnlərin janr müxtəlifliyi

***Lütviyyə Nəsibova***
Dissertant, Milli Müdafiə Universitetinin Hərbi Elmi Tədqiqat İnstitutu. Azərbaycan.
E-mail: lutviyyenesibova@yahoo.com
https://orcid.org/0000-0002-9527-3604

**XÜLASƏ**
Məqalədə hərbi mətnlərin üslub xüsusiyyətlərindən bəhs olunmuş, publisistik üslubda yazılan mətnlərin əhəmiyyəti və vacibliyi vurğulanmış, həmçinin bu üslubda olan hərbi diskurs janrları sadalanmışdır. Kursantların nitq mədəniyyətinin formalaşmasında, eləcə də ingilis dilinin tədrisində publisistik üslubda olan mətnlərin rolu qeyd edilmişdir. Məqalədə publisistik üslubun ən tipik janrları – müsahibə, icmal, şərh və son vaxtlar daha çox istifadə olunan brifinqlər haqqında məlumat verilmiş, nümunələr əsasında müqayisələr aparılmışdır. Hərbi təhsil müəssisələrində müxtəlif üslubda olan hərbi mətnlərin istifadəsinin kursantların dil biliklərinin zənginləşməsi istiqamətində əhəmiyyəti diqqətə çatdırılmışdır. Funksional üslub baxımından və kursantların üslub seçimində əhəmiyyətli olduğuna əsaslanaraq elmi məqaləni aktual hesab edirik.

**AÇAR SÖZLƏR**
icmal, şərh, brifinq, müsahibə, kütləvi informasiya vasitələri nümayəndələri

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 18.09.2024
Qəbul edilib: 09.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 50 – 57
doi.org/10.48445/r8993-3735-4428-y

**L I N G U I S T I C   I S S U E S**

# Genre Variety of Publicistic Style of Military Texts

***Lutviyya Nasibova***
Dissertatist, National Defense University Military Scientific Research Institute. Azerbaijan.
E-mail: lutviyyenesibova@yahoo.com
https://orcid.org/0000-0002-9527-3604

**ABSTRACT**
The article talks about the stylistic features of military texts. The significance and importance of journalistic style texts were emphasized. Military discourse genres in journalistic style are also listed. The role of journalistic style texts in the formation of students' speech culture, as well as in the teaching of the English language, has been noted. The most typical genres of journalistic style − interview, overview, commentary and briefings, which are used more recently, are reported, examples are given, and comparisons are made. The use of military texts in military educational institutions will help to improve the language skills of cadets and enrich vocabulary in the military field in the future. Also, I think my scientific article is relevant in terms of functional style. The article is also a helpful supply in the students' choice of style.

**KEYWORDS**
overview, commentary, briefing, interview, media representatives

**ARTICLE HISTORY**
Received: 18.09.2024
Accepted: 09.11.2024

**Giriş**

Hərbi mətnlər, əsasən, elmi və bədii üslubda təqdim olunur. Lakin publisistik üslubda olan hərbi diskurs janrları da müxtəlifliyi ilə xüsusi maraq kəsb edir. Məsələn: hərbi məqalələr, oçerklər, felyetonlar, müraciətlər, məktublar və s. Yüzlərlə məqalədə işğalçıların vəhşilikləri ilə bağlı təkzibolunmaz faktlara toxunulur, hərbi əsirlərin məktublarına, gündəliklərinə, məxfi sənədlərə, hakimiyyət orqanlarının əmr və sərəncamlarına istinad edilir, adlar, tarixlər, rəqəmlər göstərilir. Məqalələrdə müharibə haqqında acı həqiqətlər söylənilir, xalq arasında parlaq qələbə arzusu dəstəklənir, mətanətə, mərdliyə çağırış edilir.

Hərbi jurnalistika əhvali-ruhiyyə baxımından satirik və ya lirik janrlarda olur. Satirik məqalələrdə düşmən amansız istehzaya məruz qalır. Satirik publisistikanın sevimli janrlarından biri *pamfletdir*. Vətənə, xalqa ünvanlanan məqalələr, müraciətlər, məktublar, gündəliklər, yazılar janr baxımından rəngarəng olur. Nümunə olaraq, İkinci Dünya müharibəsi dövründə yapon əsir düşərgəsində olan gənc leytenantın ailəsinə kiçik fotoşəklinin arxasına yazdığı məktubu misal gətirə bilərik.

“Anam və atam, döyüş olmadan bu yolu keçmək çox çətindir. Amma biz əbədi yaşaya bilmərik. Mən ölməkdən qorxmuram, sadəcə sizi bir daha görməmək məni məyus edir. Mənim pulumla hind quşu ferması alın və orada olarkən tez-tez məni düşünün. Hər iki bacılara köməklik göstərin. Baxın, Barinin ilk ilindən artıq maşını var. Güman edirəm ki, siz Pattiyə taleyin bizim bir yerdə olmaq istəmədiyimizi deyə biləcəksiniz. Mənim üçün gözəl dua edin... və qəbiristanlığıma baş daşı qoyun. Qardaşlarımın və qardaşım oğlunun qayğısına qalın, onlar heç nədən əziyyət çəkməsinlər. Dünya durduqca sizi sevirəm və əbədi gözləyirəm. Oğlunuz leytenant Tommi Kennedi”[2].

Publisistika müharibə illərində ədəbiyyatın bütün növlərinə, ən əsası isə, esse janrına böyük təsir göstərir. Eynilə yazışmalara, yəni döyüşçülərin məktublarına da diqqət yetirmək gərəkdir. Buna nümunə olaraq, əsgər məktublarını və Azərbaycanın Milli Qəhrəmanı, şəhid Mübariz İbrahimovun valideynlərinə yazdığı son məktubunun əlyazması gənclər arasında sürətlə yayılmaqdadır.

“Canım, atam və anam. Məndən sarı darıxmayın. İnşallah, cənnətdə görüşəcəyik. Mənim üçün bol-bol dua edin. Vətənin dar günündə artıq ürəyim dözmür. Allaha xatir bunu etməliyəm. Ən azından ürəyim sərinlik tapar. Şəhid olanadək bu şərəfsizlərin üzərinə gedəcəyəm. Şəhid olsam – ağlamayın. Əksinə, sevinin ki, o mərtəbəyə yüksəldim. Allaha ibadətlərinizi dəqiq yerinə yetirin. Çoxlu sədəqə verin. Seyid nəvəsi olaraq

[2] https://www.rd.com/article/letters-from-the-front/

bunu etməliyəm. Allah böyükdür. Vətən sağ olsun. Oğlunuz Mübariz. Haqqınızı halal edin”[3].

**Əsas hissə**

Publisistik üslubun janrları (kütləvi informasiya vasitələrinin subdiskursu) nitqin dialoq xarakterinə, iştirakçıların ünsiyyətinə, yəni ünsiyyət qabiliyyətinə istiqamətlənmişdir. Odur ki publisistik üslub janrlarında ünsiyyətin institusionallıqla ciddi şəkildə məhdudlaşdırıldığını söyləmək olmaz. Publisistik üslubun janrlarında ünsiyyət həm institusional, həm də şəxsi xarakter daşıyır.

E. A. Kuçinskinin fikirlərinə əsasən, publisistik üslubun ən tipik janrları – müsahibə, icmal, şərhdir [1, s. 230]. Lakin son vaxtlar bu üslubun müasir janrlarından biri olan *brifinqlər* də geniş yayılmışdır.

*Şərh* – cari hadisələr haqqında müzakirə etmək və tam fikir bildirməkdir. Şərhdə məlum hadisə birtərəfli deyil, müxtəlif tərəflərdən nəzərdən keçirilir və təhlil edilir. Bu zaman təhlil müəllifin çıxardığı nəticə ilə başa çatır. Hərbi şərhi yaradan müəllifin kommunikativ məqsədi təsvir edilən hadisənin başvermə səbəbini və əlaqəsini müəyyən etməkdir. İdeoloji və beynəlxalq istiqamətdə olan hərbi problemlər hərbi siyasi şərhlərlə təqdim edilir. Şərhin ümumi məqsədi siyasi hadisələrə ölkənin hərbi prioritetləri tərəfindən qiymət verməkdir. Xəzər Müdafiə Tədqiqatları Mərkəzinin rəhbəri, hərbi şərhçi Ramil Məmmədli: − Azərbaycan Prezidenti Talış kəndində Ermənistana və onun havadarlarına növbəti dəfə xəbərdarlıq etdi: “Hesab edirəm ki, Prezidentin Talış kəndində səsləndirdiyi fikirlərdə əsas xətt Ermənistanı qısa zamanda konstruktiv mövqe nümayiş etdirməyə çağırış idi. Həmçinin Ermənistana növbəti dəfə xəbərdarlıq idi ki, əgər qonşu ölkə öz hərbi silahlı birləşmələrini Qarabağdan çıxarmasa və təxribatları davam etdirərsə, eləcə də üçtərəfli Bəyanat çərçivəsində üzərinə götürdüyü öhdəlikləri icra etməsə, Azərbaycan növbəti dəfə Ermənistana olduqca ağır zərbə vura bilər. Ermənistanın hərbi-siyasi rəhbərliyi və ona dəstək verən, arxasında dayanan dövlətlər anlamalıdırlar ki, Azərbaycanın bu məsələ ilə bağlı mövqeyi dəqiqdir və heç bir halda güzəştə getmək niyyətində deyil”[4].

Publisitik üslubun digər növü olan *müsahibə* janrı dilçilər tərəfindən bir diskurs forması kimi qəbul edilmiş və linqvistik fəaliyyətin fəal formasına çevrilmişdir. Müsahibə janrında spesifik dil və nitq xüsusiyyətlərini izləmək mümkündür. Bu tip mətnlər müsahibə olunan şəxslə, onun dünyagörüşü, şəxsiyyəti və cəmiyyətdəki mövqeyi ilə birbaşa

---

[3] https://upload.wikimedia.org/wikipedia/az/b/b7/Mubariz_Ibrahimovun_mektubu.jpg)

[4] https://azertag.az/xeber/2540156

əlaqələdir. Hərbi jurnalistikada müsahibə institut və onun rəsmi nümayəndələri, cəmiyyət arasında, bir növ, "körpü" rolunu oynayır. Buna görə də, demək olar ki, bütün müsahibələr səlahiyyətli şəxslərdən götürülür. Nümunə olaraq, general-leytenant Heydər Piriyevin müsahibəsini göstərmək olar.

"Hərbi təhsil sistemində islahat tarixi zərurətin nəticəsidir" – General-leytenant Heydər Piriyevlə müsahibə: "Vətən müharibəsi Zəfərlə başa çatdı. Bu hərbi tezisə görə Azərbaycanda da ordu quruculuğunu əhatə edən islahatlar aparılacaqdı. Bu barədə nə deyə bilərsiniz? – Azərbaycanın ədalətli müharibəyə başlaması tarixi zərurət idi. Danışıqlardan yayınan, regionda mövcud status-kvonu saxlamağa çalışan Ermənistanın silahlı birləşmələri istər işğal etdiyi ərazilərdə, istərsə də dövlət sərhədlərində müxtəlif səviyyəli təxribatlar törədir, həmlələr, hücumlar edirdi. Azərbaycan Ordusunun hissələri bunların qarşısını qətiyyətlə alırdı. 2020-ci il sentyabrın 27-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin döyüş əmri ilə əks-hücum əməliyyatına, ədalətli müharibəyə – Vətən müharibəsinə başlayan ordumuz düşmənin işğal dövründə yaratdığı, təkmilləşdirdiyi, yeniləşdirdiyi çoxpilləli müdafiə sədlərini qısa müddətdə darmadağın etdi. Noyabrın 8-də Şuşanın işğaldan azad edilməsi ilə Vətən müharibəsində Zəfər qazanıldı. Bu zəfərin Azərbaycanın torpaqlarının işğaldan azad olunmasına görə hərbi əhəmiyyəti, Azərbaycan Ordusunun gücünün, qüdrətinin etiraf edilməsinə görə böyük siyasi əhəmiyyəti oldu. Bu zəfər həm də ordu quruculuğunda Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin zəruri bildiyi islahatların aparılmasına zəmin yaratdı. İlk belə islahatla Komando hərbi hissəsi yaradıldı. Sonrakı islahat bilavasitə hərbi təhsili əhatə etdi"[5].

*İcmal* − konkret vaxt seqmentində hərbi sahənin vəziyyətini qiymətləndirir. Müəllif hərbi əməliyyat haqqında öz inkişaf tendensiyalarını və nəticələri ümumiləşdirir. İcmalın kommunikativ məqsədi silahlı qüvvələrin tarixi inkişafını və mövcud vəziyyətini təsvir etməkdir. Aşağıda verilən nümunə icmal janrındadır.

"Azərbaycan Müdafiə Nazirliyi həftəlik icmalını yayıb. Həftəlik icmalda ölkənin ictimai-siyasi, hərbi həyatında baş verən hadisələr yer alıb:

– Yanvarın 11-də müdafiə nazirinin birinci müavini – Azərbaycan Ordusunun Baş Qərargah rəisi general-polkovnik Kərim Vəliyev Heydər Əliyev adına Hərbi İnstitutda olub.
– Yanvarın 12-də Azərbaycan Respublikasının müdafiə naziri general-polkovnik Zakir Həsənov İtaliya Respublikasının müdafiə naziri Quido Krosettonun rəhbərlik

[5] https://ordu.az/az/news/228029/-herbi-tehsil-sisteminde-islahat-tarixi-zeruretin-neticesidir-general-leytenant-heyder-piriyevle-musahibe

etdiyi nümayəndə heyəti ilə görüşüb.
– General-polkovnik K. Vəliyev semestr imtahanlarının gedişini yoxlayıb, hərbi institutun tədris-maddi bazasına baxış keçirib, elektron kitabxana, kompüter və digər sinif otaqlarında yaradılan şəraitlə tanış olub”[6].

*Brifinq* – ingilis dilindən alınmış söz olub, mənası “bir mövzuda nəticə olaraq verilən məlumat və ya bəyanat”, “açıqlamadır”. KİV ilə iş aparıldıqda brifinq hər hansı bir məsələyə həsr olunmuş qısa mətbuat konfransı və ya rəsmi şəxslərin konkret bir mövzu üzrə media nümayəndələri ilə qısa sürən görüşüdür. Belə toplantıda xüsusi səlahiyyətli şəxs tərəfindən hökumətin, hər hansı partiyanın, təşkilatın və ya ayrıca siyasi xadimin müəyyən məsələ üzrə mövqeyi açıqlanır. Rəsmi şəxslərin kütləvi informasiya vasitələrinin nümayəndələri ilə görüşü olur və rəsmi mövqenin ifadə edildiyi məqamda hər hansı bir problemlə bağlı qısa məlumat verilir. Mətbuat konfransından fərqli olaraq, dəvət olunanların suallarına cavab vermədən hər hansı bir məlumat media işçilərinə çatdırılır və təqdimat hissəsinin mövcud olmaması ilə fərqlənir. Bundan başqa, brifinq qapalı xarakter daşıyır, ona yalnız əvvəlcədən müəyyən edilmiş KİV nümayəndələri dəvət olunur.

Ermənistan ordusunun Azərbaycan Silahlı Qüvvələrinin döyüş mövqelərini, mülki obyektləri ağır artilleriya silahlarından atəşə tutması, düşmənin cəbhəboyu hücuma keçməsi, Azərbaycan Ordusunun sentyabrın 27-də Qarabağda başladığı uğurlu əks-hücum əməliyyatı nəticəsində noyabrın 9-dək 5 şəhər, 4 qəsəbə və 286 kəndin işğaldan azadedilmə və s. xəbərləri Azərbaycan xalqına məhz brifinq vasitəsilə çatdırılmışdır. Xalq Müdafiə Nazirliyinin keçirdiyi brifinqləri səbirsizliklə gözləyirdi. Buna misal olaraq Müdafiə Nazirliyinin mətbuat xidmətinin mətbuat katibi polkovnik-leytenant Anar Eyvazovun 44 gün ərzində keçirdiyi brifinqlərdən birini nümunə gətirmək olar: “Müvəqqəti işğal altında olan Cəbrayıl rayonu istiqamətində yerləşdirilən Ermənistan ordusunun 18-ci motoatıcı diviziyasının artilleriya rəisi polkovnik Karen Babayan Azərbaycan Ordusunun cəza tədbirləri nəticəsində məhv edilib. Ermənistan ordusunun Eçmiədzin rayonunda yerləşən və işğal edilmiş ərazilərimizdə gedən döyüşlərə cəlb olunan 61-ci əlahiddə mühəndis alayının 13516 saylı hərbi hissəsinin komandiri Spartak Köçəryan da bu gün məhv edilib. Bundan başqa, düşmən ordusunun 18-ci motoatıcı diviziyasının 9-cu alayının komandiri polkovnik Artyom Poqosyan ağır yaralanıb. Ağdərə rayonunun işğal altında olan Göyarx kəndi yaxınlığındakı yüksəklik ətrafında gedən döyüşlərdə bölmələrimiz daha bir düşmən tankını məhv edib. Xocavənd rayonunun Hadrut yaşayış məntəqəsi istiqamətində Ermənistan ordusunun 1-ci alayının 3-

[6] https://sputnik.az/20230115/mudafie-nazirliyi-heftelik-icmalini-teqdim-edib-450683802.html

cü taborunun komanda-müşahidə məntəqəsi dəqiq atəşlə darmadağın olunub. Həmçinin Füzuli rayonunun işğal altında olan Aşağı Veysəlli kəndi istiqamətindən üzbəüz mövqelərimizə basqın etməyə cəhd göstərən Ermənistan ordusunun hərəkətinin qarşısı bölmələrimiz tərəfindən qətiyyətlə alınıb. Düşmən geri çəkilməyə məcbur olub”[7].

**Nəticə**

Beləliklə, publisistik üslubda yazılan hərbi mətnlərdə əsas janrlar aşağıdakı növlərlə təqdim olunur: müəllifin vəziyyəti ortaya qoyduğu, qiymətləndirdiyi, öz mövqeyinə arqumentlər gətirdiyi, problemli vəziyyətin mümkün həlli yolları haqqında fikirlərini və onun nəticələrini bildirən şərh; silahlı qüvvələrdə tarixi inkişafın və mövcud vəziyyətin təsviri vasitəsilə hərbi mühitdəki vəziyyətin ətraflı təhlilini təqdim edən *icmal;* nəhayət, hakimiyyətin rəsmi rəyini ifadə edən və hərbi institutla cəmiyyət arasında əlaqə vasitəsi kimi xidmət edən *müsahibə* və *brifinq* mövcud vəziyyətlə bağlı hərbi vəzifəlilərin qısa sürən görüşüdür. Hərbi publisistik diskurs tədqiqat üçün ən münbit zəmin hesab olunur. Bu, ilk növbədə, ona görə maraqlıdır ki, burada “dörd institusional diskursun – siyasi, hərbi, ictimai və kütləvi informasiya vasitələrinin kəsişməsində” olan mətnlər var. İnterdiskursivliyə misal olaraq mətnin kommunikativ zənginliyinin maksimum olduğu, kommunikativ gərginliyin deduktiv və ya induktiv yolla əldə edildiyi reportaj janrı, müsahibə, şərh, analitik məqalə janrını nümunə göstərmək olar. Bu janrlar müdafiə islahatları, hərbi əməliyyatlar, millətlərarası münaqişələr, dövlətlərin silah və texnikası ilə maraqlanan həm geniş, həm də peşəkar oxucu dairəsi üçün ümumi, əlçatan və başa düşüləndir. Hərbi publisistik diskursu, mətnin kommunikativ və semantik yerləşdirilməsində müxtəlif sayda iştirakçı kommunikatorlar və onların fərdi linqvistik və ekstralinqvistik təmsili ilə müəyyən diskursiv məkana malik olan spesifik janrların istifadəsidir ki, bu da institusional məzmuna uyğunluğu ilə bağlıdır.

**İstifadə edilmiş ədəbiyyat**

1. Kuchinskaya Ye. A. (2011). Zhanr i kompozitsiya teksta v voyennoy periodike (kommunikativno-semanticheskoye modelirovaniye): diss. …d. filol. n. Moskva, 467 s.
2. Simon Mellor – Clark. (2005). Yvonne Baker de Altamirano Campaign. English for the military. Student’s book 2, Macmillian, 143 p.
3. https://azertag.az/xeber/2540156

[7] https://aztv.az/az/news/9297/anar-eyvazov-bolmelerimiz-yuksek-pesekarliq-gostererek-butun-cebheboyu-suretli-eks-hucum-emeliyyatini-davam-etdirir

4. https://aztv.az/az/news/9297/anar-eyvazov-bolmelerimiz-yuksek-pesekarliq-gostererek-butun-cebheboyu-suretli-eks-hucum-emeliyyatini-davam-etdirir
5. https://defence.az/en/news/143480/azerbaijani-national-hero-mubariz-ibra-himov
6. https://ordu.az/az/news/228029/-herbi-tehsil-sisteminde-islahat-tarixi-zeruretin-neticesidir-general-leytenant-heyder-piriyevle-musahibe
7. https://upload.wikimedia.org/wikipedia/az/b/b7/Mubariz_Ibra-himovun_mektubu.jpg)
8. https://www.rd.com/article/letters-from-the-front/
9. https://sputnik.az/20230115/mudafie-nazirliyi-heftelik-icmalini-teqdim-edib-450683802.html

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 58 – 65
doi.org/10.48445/g2841-3586-3910-n

**M E T O D İ K A**

# Azərbaycan dili dərslərində oxu vərdişlərinin inkişaf etdirilməsi

***Fəridə Səfərəliyeva***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: f.safaraliyeva@mail.ru
https://orcid.org/0000-0003-1161-5759

**XÜLASƏ**
İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikasının hazırlanması böyük aktuallıq kəsb edir. Məlumdur ki, dil bir sistemdir, onda ardıcıl, həmcins və ümumiləşdirici qayda-qanunlar mövcuddur. Məktəbdə kiçik yaşlı şagirdlərə Azərbaycan dilinin müxtəlif sahələri (leksikologiya, fonetika, orfoepiya, orfoqrafiya, morfologiya, sintaksis, üslubiyyat...) üzrə sadə nəzəri və praktik bilik, bacarıq və vərdişlər aşılamaq, yazılı və şifahi nitqin, həmçinin təfəkkürün inkişafını təmin etmək, dilə həssas münasibət formalaşdırmaq, onları yuxarı siniflərdə sistematik kursu öyrənməyə hazırlamaq və s. kimi işlər aparılır. Buna uyğun olaraq, ibtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası elminin məqsədi həmin fənn üzrə kursda şagirdlərə veriləcək bilik, bacarıq və vərdişlərin sərhədini, həcmini və məzmununu hazırlamaq, bu sahədə aparılacaq işlərin səmərəli vasitə və yollarını araşdırmaq, metodik sistemini təşkil etməkdir.

**AÇAR SÖZLƏR**
dil qaydaları, orfoepiya, yazılı nitq, oxu

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 03.10.2024
Qəbul edilib: 19.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 58 – 65
doi.org/10.48445/g2841-3586-3910-n

**METHODS**

# Reading Skills in Azerbaijani Lessons to Develop

***Farida Safaraliyeva***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: f.safaraliyeva@mail.ru
https://orcid.org/0000-0003-1161-5759

**ABSTRACT**
The preparation of the Azerbaijani language teaching methodology in primary grades is of great relevance. It is known that language is a system in which there are consistent, homogeneous and generalizing rules. Young schoolchildren are taught different areas of the Azerbaijani language (lexicology, phonetics, orthoepy, spelling, morphology, syntax, stylistics...), to provide simple theoretical and practical knowledge, skills and habits, to ensure the development of written and oral speech, thinking, to form a sensitive attitude to language, to prepare them for studying the systematic course in the senior classes, etc. such work is carried out. Accordingly, the purpose of the science of the methodology of teaching the Azerbaijani language in primary grades is to prepare the boundaries, volume and content of knowledge, skills and habits to be given to students in the course on this subject, to explore effective means and ways of work to be carried out in this area, to prepare a methodological system.

**KEYWORDS**
language rules, orthoepy, written speech, reading

**ARTICLE HISTORY**
Received: 03.10.2024
Accepted: 19.11.2024

## Giriş

Ana dili şagirdləri xalqın poeziyası, poetik düşüncələri, şifahi və yazılı abidələri ilə tanış edir, onlara vətənimiz, onun tarixi və qəhrəmanlıq salnamələri haqqında məlumatlar verir. Müəllim şagirdlərin təsəvvürlərini silsilə ideyalarla, lüğət ehtiyatlarını yeni söz və ifadələrlə, sintaktik konstruksiyalarla zənginləşdirmək üçün uşaq ədəbiyyatını dərindən öyrənməli, oxu materialının məzmununa uyğun optimal vasitə, priyom və metodları seçməyi bacarmalıdır. Ana dilinin tədrisində əyanilik müstəsna əhəmiyyətə malikdir. Savad təlimi dövründə oxu və Azərbaycan dili materiallarının tədrisi (xüsusilə qrammatik anlayışların açılışında, orfoqrafik və orfoepik qaydaların mənimsədilməsində), həmçinin nitq inkişafı prosesində əyanilik ön plana çəkilməlidir. Böyük ədəbiyyatşünas ədib F. Köçərli nitqin aydınlığını təfəkkürün düzgün işləməsi, fikrin düzgünlüyü ilə əlaqələndirərək deyirdi: "Bizim yəqinimizdir ki, dili dolaşıq şəxsin fikri də dolaşıqdır. Doğru və salamat fikirli adamların kəlamı da həmişə aydın, açıq və düzgün olur".

Məqalə, Azərbaycan dili dərslərində oxu vərdişlərinin inkişaf etdirilməsi ilə bağlı olduğundan, ilk olaraq, oxu ilə bağlı məsələlərə toxunaq. Savad təlimi dövründə oxu üzrə iş aparılarkən aşağıdakı cəhətlər diqqət mərkəzində saxlanılmalıdır:

a) oxu təlimi dilin səs sisteminə uyğunlaşdırılmalı;
b) səs və hərf arasındakı münasibətlər açılmalı;
c) oxu prosesində dilin ədəbi tələffüz qaydaları gözlənilməli;
d) oxu təlimində düzgünlüyə, sürətə, ifadəliliyə və şüurluluğa diqqət yetirilməlidir.

Məlumdur ki, savad təlimi dövründə oxu səslər üzərində aparılan işlərə əsaslanır. Şagirdlər hələ məktəbəqədərki dövrdə öyrəndiyi, nitq praktikasında işlətdiyi sözləri, onların tərkibindəki ayrı-ayrı səsləri fərqləndirməyi bacarırlar. Savad təlimi dövründə isə sözdəki hər bir səs müxtəlif səslərin tərkibindən ayrılır, diqqətlə öyrənilir.

## Əsas hissə

Azərbaycan dilçiliyinin əsas bölməsi sayılan qrammatika özündə morfologiya və sintaksisi birləşdirir. Dilçiliyin morfemləri tədqiq edən morfologiya bölməsində sözlərin qrammatik tərkibi, qrammatik quruluşu, nitq hissələri, onun təsnifi geniş yer alır. Morfologiyanın elmi-nəzəri əsasları qrammatikanın digər şöbəsi olan sintaksis, onun ayrı-ayrı mövzularının daha dərindən mənimsədilməsi üçün real imkanlar açır.

Nitq hissələri arasında sifətin xüsusi yeri vardır. Belə ki, sifət dilin lüğət tərkibinin zənginləşməsində, poetik təfəkkürün inkişaf etdirilməsində xüsusi əhəmiyyətə malikdir. Sifət Azərbaycan dilçilik ədəbiyyatında ən geniş formada tədqiq olunan nitq hissəsi olub, Azərbaycan dilində əsas nitq hissələri arasında öz işlənmə dərəcəsinə və

zənginliyinə görə isim və feildən sonra əsas yerlərdən birini tutur, digər nitq hissələrindən semantik və qrammatik təbiətinə, morfoloji əlamətinə, sintaktik vəzifəsinə görə seçilir. Bu sözlərin leksik təbiətində əlamət və keyfiyyət məzmunu olduğu kimi, ümumi qrammatik mənasında da əlamət, keyfiyyət xarakteri vardır. Bu xüsusiyyət onun isim, say, əvəzlik, feil və zərflərdən fərqlənməsində əsas rol oynayır. “İsim” bölməsində qeyd etmişdik ki, ilkin çağlarda insan dərketmə prosesində onu əhatə edən əşyalara ad vermişdir. Sifətin əsas xüsusiyyəti də məhz onun cümlə daxilində isimlə yanaşı işlənməsidir. Yəni əşya yoxdursa, onun hansı əlamət və keyfiyyətindən söz açmaq olar? Deməli, sifət əşyanın əlamət və keyfiyyətini bildirir, isimlə (əşya ilə) bağlı olur, aralarında yanaşma əlaqəsi vardır, əşya bildirən sözdən qabaq gələrək, onu izah edir. Bir nitq hissəsi kimi sifətin özünəməxsus xüsusiyyətləri vardır ki, bunlar sifəti digər nitq hissələrindən fərqləndirir [1, s. 106].

İsmin tədrisində ən mühüm və vaxt tələb edən məsələ onun hallanmasının öyrədilməsidir. İlk olaraq ismin çıxışlıq halının yazılışına nəzarət edilməlidir. Şagirdlərə *sinif, isim, nəsil, sətir, fikir* və s. kimi sözlərin hallanmasının özünəməxsus xüsusiyyətləri izah edilməlidir. Onlar bilməlidirlər ki, belə sözlər hallanarkən yiyəlik, yönlük və təsirlik hallarında sözün ikinci hecasındakı [*i*] səsi düşür. Başqa bir məqam, isimlər hallandırılarkən *q* samitinin *ğ*-ya, *k*-nin isə *y* samitinə keçməsi ilə əlaqədar bir sıra cədvəllərdən istifadə etmək olar. Bu zaman həm dil qaydaları öyrənilir, həm də ədəbi tələffüzlə bağlı məqamlara toxunulur.

II sinif Azərbaycan dili dərsliyində verilmiş mətnə diqqət edək: *“Qədim zamanlarda türk elində belə bir adət var idi: yeni doğulan körpəyə ad qoyulmazdı. Uşaq böyüyəndə ona adqoyma mərasimi keçirilərdi. Qohum-qonşular bir araya toplaşar, elin ağsaqqalı Dədə Qorqud gələrdi. O, gəncin əməllərinə uyğun ad seçərdi. Qopuz çalaraq gəncin adını hər kəsə bəyan edər, ona öz xeyir-duasını verərdi”.*

Söz boğçasında şagirdlərə tanış olmayan sözlər əks olunmuşdur: *adət, ağsaqqal, qopuz, bəyan etmək, xeyir-dua*. Müəllim motivasiya mərhələsində qəhrəmanlıq dastanları barədə şagirdlərə məlumat verməlidir.

**Tapşırıq E:**

“Qopuz” sözünün izahını oxuyun. Varlığın əlamətlərini və ümumi mənasını bildirən sözləri müəyyən edin.

Qopuz − saza oxşayan, qədim, simli musiqi alətidir [4, s. 22]. Beləliklə, müəllim tədris prosesində şagirdlərin qeyri-fəal lüğət fondundakı sözləri fəal lüğət fonduna gətirir. Dərslikləri vərəqləyəndə müxtəlif janrdan olan bədii əsərlərə rast gəlirik.

Şagirdlərin hafizəsini möhkəmləndirmək, nitqini inkişaf etdirmək, dünyagörüşünü genişləndirmək, estetik zövqünü tərbiyə etmək baxımından şeirlər müstəsna

əhəmiyyətə malikdir. Şeir oxumağın sirlərini şagirdlərə başa salmaq üçün müəllim ifadəli oxu nümunəsi verməlidir. Çünki ucadan, ifadəli oxu prosesində şeirin ölçüləri (heca, vəzn, ritm və s.) daha aydın qavranılır. Şeirlər orfoepik normaların mənimsədilməsi baxımından da məqsədəuyğun hesab edilir. Məhz bu baxımdan Xalq şairi B. Vahabzadənin dərslikdə verilmiş şeiri hər dövr üçün oxunaqlı olub kiçik yaşlı məktəblilərin maraq dairəsinə aiddir:

Ey hörmətli müəllim,
Hər könüldə yerin var.
Hər kənddə, hər şəhərdə
Sənin meyvələrin var.
Əkdiyin ağacların
Gülü, çiçəyi solmaz.
Dünyada sənin kimi
Barlı bağban tapılmaz.

Bu şeiri öyrəndikdən sonra müəllim şagirdlərlə əzbər yazı apara bilər. Şagird əzbər yazı zamanı həm şeiri əzbərləyir, həm də onda düzgün orfoqrafik bacarıqlar formalaşır. Bilirik ki, əzbər yazı həm üzündənköçürmə, həm də imla ilə bağlıdır. Müəllim başqa bir metod olaraq şagirdlərə şeiri nəsrə çevirməyi tapşıra bilər.

Təhsil elə bir sahədir ki, orada yalnız hüquqi baza ilə kifayətlənmək olmaz. Burada pedaqoji, metodiki, elmi-nəzəri əsaslar da vacibdir. Məhz bu əsaslar məktəbin ahəngini təşkil edir. Əgər yanlışlıqlar olarsa, məktəbin, təhsilin ahəngi pozular. Müasir dövrdə ciddi zərurət yaradan problemlərdən biri də dilimizin zəngin lüğət tərkibinin araşdırılmasıdır. M. C. Paşayev yazırdı ki, *"müəllim yanan çıraqdır. Onun işığından yararlanmaq istəməyənlər kor qalarlar. Balalarımızın mənəvi atası Müəllimdir"*. Bu fikir tamamilə doğrudur, çünki bünövrə ibtidai siniflərdən başlayır. Bu mənada bu gün müəllimlərin öhdəsinə böyük məsuliyyət düşür.

Bu gün ibtidai sinif müəllimi tədris prosesində bir neçə məsələni aydınlaşdırmalıdır: şagird istər oxu, istərsə də dil qaydaları ilə bağlı nəyi öyrənəcək? Öyrəndiyi mövzuda, məsələn, leksikologiya ilə bağlı hansı məsələlər önə çəkiləcək? Bu, birbaşa onların yaş səviyyəsinə uyğunluq baxımından nəzərə alınmalıdır. Kiçik yaşlı məktəbliləri həvəsləndirmək, onların fəaliyyətini təşkil etmək baxımından müəllim hansı priyom və vasitələr seçməlidir? Dil qaydalarını öyrədərkən hansı təhsil, inkişaf və tərbiyəedici məqsədlər yerinə yetiriləcəkdir?

Məlumdur ki, təlim prosesinin iki tərəfi vardır: *tədrisetmə və öyrənmə*. Sözsüz ki, tədrisetmə birbaşa müəllimin fəaliyyəti ilə bağlıdır. Proqram, dərslik, təhsilə dair rəsmi

sənədlər burada öz əksini tapır. Öyrənmə dedikdə isə təlim prosesinin obyekti olan şagird nəzərdə tutulur. Təlim prosesində müəllim istər oxu, istərsə də dillə bağlı qaydaları şagirdlərə çatdırmağa çalışır, onlarda müxtəlif bacarıq və vərdişlər formalaşdırır. Həmin işə nail olmaq üçün isə müəyyən vasitələrdən istifadə edilir. Tədrisdə bu vasitələrə yol, üsul, qayda, yaxud da tərz deyirlər. Deməli, biliyi şagirdlərə çatdırmaq yolları, ilk növbədə, təlim üsullarını – öyrənmə və öyrətmə prosesini təşkil edir. Təlim texnologiyaları ilə bağlı bu günə qədər çoxsaylı fikirlər söylənilmişdir. Burada, ilk olaraq, yanaşma önəmlidir. Təlim üsullarının müxtəlifliyi imkan verir ki, müəllim öyrədiləcək materialın ən vacib olanını seçsin. Həmin seçilən üsul verilmiş biliyin ibtidai sinif şagirdinə canlı, maraqlı və yaradıcı şəkildə çatdırılmasına imkan yaradır. Ona görə də müəllimlər təlim üsullarından birini seçmək istəyərkən dərslik materialının xarakterinə diqqət yetirirlər. Deməli, biz təlim üsulları dedikdə, bilikləri şagirdlərə öyrətmək və qazandırmaq yollarını başa düşməliyik.

II sinif Azərbaycan dili dərsliyində “Qələbə” mətni əks olunub. Mətndə söz boğçası olaraq *heyifsilənmək, övlad, uğur, cəzalandırmaq* sözləri verilmişdir.

**Tapşırıq D:**

Mətndən hökmdarın əmrini bildirən cümlələri seçin. Sözləri sətirdən-sətrə keçirilməsi qaydalarına əməl etməklə köçürün [4, s. 50]. Deməli, şagird mətni şüurlu oxuyur, müəllim isə dillə oxu arasında inteqrasiya aparır.

Başqa bir səhifədə “Uğurun sirri” adlı mətn verilmişdir. Söz boğçasına nəzər yetirək: *sükuta qərq olmaq, mübarizə aparmaq, görmə qabiliyyəti, nikbin, ümidini itirmək*. Bunlardan yalnız *nikbin* sözündə deyiliş və yazılış arasında heç bir fərq yoxdur. Peşəkar müəllim tədris zamanı şagirdlərə bu sözlərin həm deyilişi və yazılışı arasındakı fərqi, həm də mənalarını izah etməlidir.

Təcrübə göstərir ki, tipindən və məzmunundan asılı olaraq, keçirilən dərs qarşısında müxtəlif məqsədlər qoyula bilər. Lakin bunlardan biri əsas, aparıcı, qalanları isə yardımçı, ikinci dərəcəlidir. Məsələn, II sinifdə “Eyniköklü sözlər” mövzusunun tədrisində əsas məqsəd materialın məzmununu şagirdlərə (eyniköklü sözlərin yaranmasını, sözlərin törəməsini, onların səbəblərini və s.) dərindən mənimsətməkdirsə, ikinci məqsəd eyniköklü sözlər hesabına şagirdlərin lüğət ehtiyatını zənginləşdirmək, həmin sözlərin düzgün yazılış qaydasını öyrətmək, rabitəli nitqin inkişafı üçün müəyyən baza yaratmaq və s. ibarət olmalıdır. Professor Y. Kərimov qeyd edir ki, *“sözün tərkibinin öyrənilməsi nitq inkişafı və orfoqrafik vərdişlərin möhkəmlənməsi üçün faydalıdır”* [3, s. 325]. Təlim prosesində də bu məqsədlərin heç biri ayrıca həyata keçirilmir, onlar əsas məqsədin fonunda kompleks halda qaynayıb-qarışır, biri digərinin inkişafına müsbət təsir göstərir. Beləliklə də, nəzəriyyədən

praktikaya, praktikadan da nəzəriyyəyə yol açılır, məktəblilər qrammatikadan öyrəndiklərini yazılı və şifahi nitqlərinə asanlıqla tətbiq etməyə başlayırlar [5, s. 220].

Şagirdlərin şifahi nitqi üzərində aparılan müşahidələr göstərir ki, onların nitqi bəzən nöqsanlı olur. Məsələn, ayrı-ayrı səs və sözlərin yanlış tələffüz edilməsi, nitqin normalarının, qrammatik qaydaların, üslub tələblərinin gözlənilməməsi, yerli şivə xüsusiyyətlərinə yol verilməsi kimi nöqsanları müşahidə etmək olar. Şagirdin lüğət ehtiyatının genişləndirilməsi zamanı müəllim çətin sözlərin izahından, danışıqda obrazlı ifadələrdən istifadə etməlidir. Lüğət ehtiyatını zənginləşdirmək üçün bədii mətnlər, eləcə də çalışma üzrə işlərin təşkili daha məqsədəuyğundur.

Məlumdur ki, nitq inkişafı Azərbaycan dili təliminin başlıca prinsipidir. Bu sahədəki işlər − hər bir dil ehtiyatının zənginləşdirilməsi, danışarkən ədəbi tələffüz qaydalarının gözlənilməsi, düzgün cümlə qurma bacarıqlarının və rabitəli nitqin inkişafı hər bir dərsdə özünə yer tapır. Sinfin ümumi səviyyəsinin yüksəldilməsi məktəblilərin digər fənlərin məzmununu dərindən mənimsəməsini təmin edir, onların təşəbbüskarlıq, yaradıcılıq qabiliyyətini formalaşdırır.

III sinif Azərbaycan dili dərsliyinə aid “İş dəftəri”ndəki tapşırıqlara nəzər salaq:

Dördündən biri səhv yazılıb [2, s. 5]:

| | | | |
|---|---|---|---|
| a) yovşan | b) şakalad | c) xahiş | ç) sual |
| a) qəhrəman | b) mubahisə | c) müşahidə | ç) nəqərat |
| a) müəllif | b) saat | c) təccüb | ç) ailə |

Sözləri kök və şəkilçiyə ayıraraq cədvəli doldur [2, s. 12].

| **Söz** | **Kök** | **Şəkilçi** |
|---|---|---|
| *yaxşılıq* | *yaxşı* | *-lıq* |
| *yazdı* | | |
| *qutudan* | | |
| *gözəllik* | | |
| *mərhəmətli* | | |
| *gülüş* | | |
| *köməksiz* | | |
| *təmirli* | | |
| *binada* | | |

Təbii ki, şagirdlər bu tapşırığı yerinə yetirərkən müəllim yazılışı ilə deyilişi fərqli olan sözləri tapmağı və cümlədə işlətməyi qeyd edə bilər. Şifahi və yazılı nitq arasında fərq nədən ibarətdir?

Şagirdlərin şifahi nitqində lüğət ehtiyatının zənginləşdirilməsi yazılı nitqin lüğətində də özünəməxsus yer tutur. Şifahi nitqdə düzgün cümlə qurmaq vərdişlərinin formalaşdırılması yazıda məhz üslub səhvlərinin qarşısını alır. Həmçinin savadlı, yazılı nitqin bir sıra xüsusiyyətləri şifahi nitqə təsir edir. Bir çox cəhətlərinə görə şifahi və yazılı nitq bir-birindən əsaslı surətdə fərqlənir. Müəllim bu fərqi bilmədən nitq inkişafı üzrə işi düzgün qura bilməz. Şifahi nitq iki və daha artıq şəxs arasında müəyyən bir şəraitdə baş verən prosesdir. Şifahi nitq dialoji olur, amma yazılı nitqin kimə aid olduğunu müəyyən etmək çox vaxt çətinlik yaradır. Yazılı nitq leksik, morfoloji və sintaktik cəhətdən cilalanmış nitq sayılır. Şifahi nitq yazılı nitqi inkişaf etdirdiyi kimi, yazılı nitq də, öz növbəsində, şifahi nitqi təkmilləşdirir. Nitqin düzgünlüyündən yalnız o vaxt danışmaq olar ki, o, dil normalarını korlamasın.

**Nəticə**

Dil qaydalarını şagirdlərə mənimsətmək üçün müəllim bədii ədəbiyyatlardan, elmi-kütləvi mətnlərdən bacardığı qədər çox istifadə etməlidir. Şagirdlər başa düşməlidirlər ki, qrammatikanın qanunlarına riayət edilməsi nitq mədəniyyətinin əsas şərtlərindən biridir. Qrammatikanı şagirdlərə mənimsətmək üçün gətirilən nümunələr, orfoqrafiya və durğu işarələrinə aid mətnlər şagirdlərin biliyini formalaşdırmağa kömək etməlidir. Mətnlər isə yalnız dar bir ixtisasa deyil, həmçinin həyatın bütün sahələrini əhatə edən mövzulara aid olmalıdır.

**Məqalənin elmi yeniliyi.** İbtidai siniflərin Azərbaycan dili dərslərində oxu ilə bağlı məsələlərin həlli yolları araşdırılmışdır.

**Məqalənin praktik əhəmiyyəti.** Məqalədən ibtidai sinif müəllimləri və gənc tədqiqatçılar yararlana bilərlər.

**İstifadə edilmiş ədəbiyyat**

1. Hümmətova R. (2019). Ana dili – II (dərs vəsaiti). Bakı, 340 s.
2. İsmayılov R., Nurullayeva Ü., Zahidova Ş., Bayramova İ., Xanalıyeva A., Cəlilova K. (2023). Ümumtəhsil məktəblərinin 3-cü siniflər üçün Azərbaycan dili fənni üzrə dərsliyin iş dəftəri. Bakı, 144 s.
3. Kərimov Y. (2015). Ana dilinin tədrisi metodikası. Bakı.
4. Nurullayeva Ü., Zahidova Ş., Bayramova İ., Xanalıyeva A. (2020). “Azərbaycan dili” − tədris dili fənni üzrə 2-ci sinif üçün dərslik. I hissə. Bakı.
5. Rəhimov A. (2015). Ana dilinin tədrisi metodikası (ibtidai siniflərdə). Bakı.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 66 – 72
doi.org/10.48445/b6823-8418-5420-u

METODİKA

# İbtidai siniflərin Azərbaycan dili dərslərində şagirdlərin humanizm tərbiyəsinin formalaşdırılması imkanları

***Könül Məmmədova***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: könül.1970@mail.ru
https://orcid.org/0000-0001-8664-4912

**XÜLASƏ**
Məqalədə ibtidai siniflərdə tədris olunan Azərbaycan dili dərslərində şagirdlərdə humanizm tərbiyəsinin aşılanması yollarından bəhs olunur. Humanizm insan cəmiyyətinin məhsuludur. Belə ki, bu cəmiyyətdə yaranmış tələbatlar əmək prosesində meydana gəlmişdir. Davranış normaları adi vaxtlarda, əmək prosesində, eləcə də istirahət zamanı müəyyən qaydaların yerinə yetirilməsinə ehtiyac olan dövrdən yaranmağa başlamışdır. Bu normalar insanın ictimaiyyət, kollektiv, eləcə də ayrı-ayrı insanlarla münasibətini müəyyənləşdirir. Müstəqillik qazandığımız müasir dövrdə cəmiyyətdə mənəvi dəyərlərin rolu xeyli artmış, mənəvi amillərin təsir dairəsinin genişlənməsinə ehtiyac yaranmışdır.

**AÇAR SÖZLƏR**
humanizm, müstəqillik, vətənə məhəbbət, mənəvi dəyərlər, insani münasibət

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 16.10.2024
Qəbul edilib: 28.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 66 – 72
doi.org/10.48445/b6823-8418-5420-u

M E T H O D S

# Possibilities of Formation of Humanistic Education of Students in Azerbaijani Language Classes of Primary Classes

***Konul Mammadova***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: könül.1970@mail.ru
https://orcid.org/0000-0001-8664-4912

**ABSTRACT**
The article deals with the ways of inculcating humanism in students in the Azerbaijani language lessons taught in primary classes. Humanism is a product of human society and it was formed in the process of labor and needs that arose in this society. Norms of behavior began to emerge when there was a need to fulfill certain rules during the work process, during normal times, as well as during rest. These behavioral norms determine a person's relationship with society, collective and individual people. In the modern period when we gained independence, the role of moral values in our society has increased significantly, and there is a need to expand the sphere of influence of moral factors.

**KEYWORDS**
humanism, independence, love of country, moral values, humane attitude

**ARTICLE HISTORY**
Received: 16.10.2024
Accepted: 28.11.2024

**Giriş**

Şagirdlərin insan hüquqlarına əməl etməsi ruhunda tərbiyə edilməsinə gedən yol mənəvi tərbiyədən başlayır. İnsan hüquqları haqqında biliklərin mənimsədilməsi azad insanın ən mühüm mənəvi keyfiyyəti olan şərəf və ləyaqətinin, cavabdehlik hissinin formalaşmasına kömək edir. Təhsili özünün prioritet sahələrindən biri hesab edən Azərbaycan dövlətinin başlıca məqsədi də demokratik dünyagörüşlü, bacarıqlı, təşəbbüskar və məsuliyyətli vətəndaşlar yetişdirməkdir. Uşaqların məktəbə gəldiyi ilk gündən başlayaraq həm təlim prosesində, həm də dərsdənkənar vaxtlarda uşaqlarda kiçik qrup və kollektivdə birgə oxumaq, işləmək, doğru danışmaq, yaxşı yoldaş və dost olmaq, lazım gəldikdə başqalarına kömək etmək, bir sözlə, ətrafındakılara insani münasibət bəsləmək vərdişlərini tərbiyə etmək üçün mühüm bünövrə yaranır.

Şərqin görkəmli sənətkarı, qüdrətli Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvinin əsərləri neçə əsrlər keçsə belə bu gün də dərsliklərdə aktuallıq, nümunəvilik rəmzi hesab edilir. Onun əsərlərində dostluq haqqında çox sayda nümunələr var. Müəllim Azərbaycan dili dərsində uşaqlara şairin dostluq haqqında fikirlərini xatırladır. Bildirir ki, həqiqi dost insanı darda qoymur, əksinə, tordan çəkib çıxarır, lazım gəldikdə eybini üzünə deməkdən çəkinmir. Ata – xəzinə, qardaş dayaqdırsa, dost hər ikisidir.

İbtidai siniflərdə tədris olunan Azərbaycan dili dərsliklərində "Vətənim Azərbaycandır", "Dostluq", "Əməksevərlik", "Ana məhəbbəti", "Mərhəmət", "Vətən sevgisi", "Mən sülhə səs verirəm", "Milli dəyərlərimiz", "Az danışmağın gözəlliyi", "Halal pul", "Əsgər marşı", "Yaxşılığa əvəz", "Ən böyük dövlət", "Təndir tikə bilməyən ev tikə bilməz", "Ən böyük xəzinə", "Qaraca qız və Ağca xanım", "Göyərçin" və s. kimi əxlaqi dəyərləri, humanizmi aşılayan mövzular verilmişdir.

**Əsas hissə**

İbtidai siniflərin Azərbaycan dili dərslərində şagirdlərdə dostluq, yoldaşlıq xüsusiyyətlərini aşılamaq məqsədilə onlara "Mənim dostum kimdir?" mövzusunda inşa, yaxud esse yazdırılır. Onlardan bəzi nümunələrə nəzər salaq:

Şagirdlərdən biri yazır: *"Hər bir insanın dostu olmalıdır. Dostdan heç vaxt zərər gəlməz. Axı dost-dosta arxadır. Mənim əsl dostum Caviddir. O, yaxşı oxuyur, etibarlıdır, mehribandır. Mənim fikrimcə, dost öz dostunu başa düşməlidir. Əgər dostum çətin vəziyyətə düşərsə, ona mütləq kömək edərəm. Biz bütün çətinlikləri bir yerdə asanlaşdırırıq. Mən heç vaxt dostumdan ayrılmayacağam".*

Digər bir şagird yazır: *"Mənim dostum ağıllı və səliqəli oğlandır. O, anasının sözünə baxır. Onun səliqəli olması mənim xoşuma gəlir. Əsl dost mehriban olmalıdır".*

III sinfin Azərbaycan dili dərsliyində "Nəbi və Tahir" mövzusunda 2 saatlıq əsas mətnlə dinləmə mətnləri üzrə 1.2.1; 2.2.1 məzmun standartları və aşağıdakı təlim məqsədləri reallaşdırılır:

...dinlədiyi bədii mətnin ideyasını müəyyən edir, onu oxuduğu mətnlə müqayisə edir;

...bədii əsərin müəyyən hissəsini oxuduqdan sonra baş verəcək hadisələri proqnozlaşdırır;

...atalar sözündə və ya aforizmdə ifadə olunmuş kəlamla bağlı öz fikirlərini yazır;

...deyilişi və yazılışı fərqlənən sözləri müəyyən edir.

Mətnin məzmunu:

*İndicə, elə zəng vurulan kimi uşaqlar ingilis dili otağına yüyürməyə başladılar. Onlar tələsirdilər. Birdən Nailənin əlindəki qələmdan və qələmdandan karandaşlar yerə düşüb səpələndi.*

*Amil bir anlığa dayandı, kömək etmək istədi, amma dərsə gecikəcəyini düşünüb sinfə sarı qaçdı. Mansur Nailəyə yaxınlaşıb karandaşları toplayırdı. Odur ki hər ikisi dərsə gecikdilər. Sinfin qapısı önündə dayandılar. Müəllim:*

*– Mansur, Nailə! Niyə gecikmisiniz?*

*Mansur heç nə deməyib başını aşağı saldı və susmaqla kifayətləndi...* [5, s. 58].

Müəllim sinfə sual verir: "– Əgər Mansur müəllim tərəfindən cəzalandırılsaydı, o, sizcə, bir də yoldaşına kömək edərdimi?"

Şagirdlərin fikirləri dinlənilir. Müəllimin yönəldici sualları ilə əlaqədar şagirdlər, təxminən, aşağıdakı kimi nəticələrə gəlirlər:

...hər bir hərəkətə görə tənbeh etməyə tələsmək olmaz. İlk növbədə səhv hesab edilən hərəkətin başvermə səbəbini araşdırmaq lazımdır.

...insan ilk növbədə vicdanı qarşısında cavabdeh olmalı, vicdanının cəzasından qorxmamalıdır.

Belə mətnlərdən istifadə şagirdlərdə nitq və təfəkkür inkişafının tərbiyəedicilik aspekti kimi də çıxış edir. Çünki gözlənilən nəticələr də elə bunlarla ölçülür.

III sinif Azərbaycan dili dərsliyində verilmiş "Tacir və dostu" adlanan əsas mətn üzrə tərtib olunmuş dinləmə mətni "Əmanətə xəyanət olmaz" adlanır.

Dinləmə mətninin qısa məzmununa nəzər yetirək:

*Səhər hələ tam açılmamış bir kişi hamama gedərkən yolda oğrunun birini öz dostu hesab edib cibindəki pulunu ona verir. Oğru pulu götürüb getmir, kişinin hamamdan çıxmasını gözləyir. Pulu yiyəsinə qaytarır və deyir ki, sən onu mənə əmanət etmişdin. Əmanətə xəyanət olmaz* [6, s. 201].

Müəllim mətn üzərində öncədən proqnozlaşdırma işləri aparır, qrup işi təşkil edir. Onun verdiyi suallar dinlənilir: – *Sizin fikrinizcə bu oğru nə edəcək? Siz olsaydınız, necə hərəkət edərdiniz?*

Şagirdlər öz mülahizələrini söyləyirlər. Mətn müəllim tərəfindən yenidən oxunur və o, şagirdlərin oğruya olan münasibətini öyrənmək istəyir.

Müəllim şagirdlərə aşağıdakı suallarla müraciət edir:

1. *Əsərdəki oğru obrazına münasibətiniz necədir?*
2. *Əgər pul kisəsini oğru geri götürsəydi, fikrinizcə, onu sahibinə qaytarardı?*
3. *Siz özünüz əmanətin sahibinin yerinə olsaydınız, oğruya nə cavab verərdiniz?*

Bu suallar əsasında şagirdlərin mülahizələri dinlənilir və müzakirə başlayır. Daha sonra müəllim insanlar arasında bir-birinə olan etiqad, sədaqət, inam haqqında danışır, liderlər də öz qruplarının bu barədə fikir və mülahizələrini dilə gətirirlər. Şagirdlərin cavabları inşalara çevrilir.

Nümunələr:

Şagird Z. : *“Oğru kişinin onu öz dostu ilə səhv saldığını görür, ancaq sevinmir. Əmanəti saxlamaq və geri qaytarmaq qərarına gəlir. Çünki, görünür, bir vaxt o da, ola bilsin, atasından eşitmişdir ki, əmanətə xəyanət etmək günahdır. Allah belələrini bağışlamır. Əgər bu hərəkəti ilə o, oğurluqdan da imtina etsəydi, Allah onun günahlarını bağışlayardı. Çünki Allah bağışlayandı. Xüsusən də, əmanətə xəyanət etməyənləri.*

*Əlbəttə, mən nə oğru olmaq, nə də dostu başqası ilə səhv salmaq istəyərdim. Mən oğrunun belə asanca düzəlməyinə inanmıram. Bu mənim qəti fikrimdir. Çünki cibgirin qadının pulunu çıxarıb getməsini anamdan eşitmişəm. Oğrular dəhşətli insanlardır. Əgər onlara insan demək olarsa...”*

Şagird N. : *“Oğru əmanətə xəyanət etməz? Edər, edər! Fikrimizcə, “oğru” sözü əvəzinə orada “tanımadığı bir kişi” demək lazımdır. Sadəcə deyilməlidir ki, kişi pulunu saxlamağa dostu hesab etdiyi bir nəfərə verib, o adam da halal insan imiş, odur ki pulu yiyəsinə qaytarıb. İnsanlar iki cür olur: halallıqla yaşayanlar, haram ilə yaşayanlar.*

*Mən belə adamlar haqqında az-çox oxumuşam. Zəhmət çəkib işləyənlər halallardır”.*

Şagird V. : *“Hamama gedən kişi cibindəki pulunu dostu bildiyi adama əmanət verdiyini zənn edir. Həmin adam da məsələni başa düşür və xəyanət etməmək qərarına gəlir. Maraqlı əhvalatdır. Söhbət inamdan, sədaqətdən gedir. Mən istəyirəm ki, insanlar bir-birinə etibar etsinlər, pullarını da, mallarını da.*

*Mənə də etibar edilsəydi, mən də əmanətə xəyanət etməzdim. Ancaq yaxşılıq etmək hər adamın işi deyil. Əmanət saxlamaq insana hörmət qazandırar. Belələri hər zaman*

*olub və indi də var. Uşaqların içərisində inam, etibar qazananlar çoxdur. Mən elələri ilə dostluq etmək istəyirəm".*

Göründüyü kimi, şagirdlər arasında *əmanət, xəyanət, inam, etibar* və s. bu kimi sözlər əsasında ifadə mətnini inkişaf etdirib inşaya çevirməyi bacaranların sayı az deyil.

İnsan uşaqlıq dövründə olduğu kimi, qocalıqda da humanist münasibətə möhtacdır. Buna görə də yaşlılar həssas qəlbli uşaqlara daha kiçik yaşlarından humanist duyğular aşılamalıdırlar ki, qocalıb əldən düşdükləri zaman onlardan kömək ala bilsinlər [1, s. 87].

Azərbaycanın görkəmli mütəfəkkiri A. Bakıxanov yazırdı: "Dünyada heç bir şey təbiətin ziddinə çıxa bilməz... Lakin insan müstəsnadır, çünki o, bir işi görməyə və ya görməməyə muxtardır. Bu səbəbdən də o, həmişə yaxşı, həm də pis iş görə bilər. Aləmdə əsl məqsəd və həqiqi məsləhət xeyirdən ibarət olduğu üçün aləmin ən şərafətli cüzi olan insan da gərək borclarını əta eləsin və öhdəsinə düşən vəzifəni unutmasın. Həmişə yaxşılıq etməyə çalışsın və bilsin ki, əxlaqı təmizləyib islah etməkdə və maarif təhsil etməkdə məqsəd yaxşılıqdır" [2, s. 41].

**Nəticə**

Əxlaqi söhbətlərdə faktların rəngarəng, canlı, inandırıcı olmasına diqqət yetirmək lazımdır. Gətirilən hər bir misal və dəlil əxlaqi söhbətin məqsəd və vəzifəsinə xidmət etməlidir. Belə olduğu halda şagird öz davranış və hərəkətləri haqqında düşünərək düzgün nəticə çıxara bilər.

Hər bir şagirdin hərəkətləri diqqətlə izlənilməli, aparılan əxlaqi söhbətlərdə müəyyən edilmiş qaydanı pozan şagirdlərin davranışları müzakirə edilməlidir. Şagirdlərin müsbət və mənfi xüsusiyyətlərini aşkar etmək, onların səbəblərini kollektiv qarşısında müzakirə və təhlil etmək müəllimdən böyük səy tələb edir. Buna görə də əxlaqi söhbəti canlı, inandırıcı və təsirli etmək üçün ciddi hazırlaşmaq lazımdır.

İnsana humanist münasibətin nümunəsi ibtidai siniflərdə tədris olunan Azərbaycan dili dərslik və metodik vəsaitlərində lətifə, nağıl və dastanlarımızda verilən müsbət qəhrəmanlar vasitəsilə göstərilmişdir. Bu qəhrəmanlar həssas və qayğıkeşdirlər. Onların insanpərvərliyi, hər şeydən əvvəl, kütlənin qeydinə qalmaqda, elin səadətinə, namusuna toxunmaq istəyənlərlə amansız mübarizə aparmaqda təzahür edir. Dastan və nağıllardakı qəhrəmanlar xalqın firavan yaşayışını təmin etmək üçün mümkün olan hər cür vasitədən istifadə edirlər.

Qeyd etmək lazımdır ki, dövrümüzün mürəkkəb tarixi hadisələrinin, inkişaf etmiş azadlıq ideyalarının da insan psixologiyasına, cəmiyyətimizdə şəxsiyyətin formalaşdırılması prosesinə böyük təsiri olmuş və olmaqda davam edir. 44 günlük Və-

tən müharibəsi bir daha sübut etdi ki, bu gün məktəblərimizdə tədris olunan ana dili dərslərində torpaqlarımızı düşmən tapdağından azad edən əsl vətənpərvərlərin yetişdirilməsi, ana vətənin azadlığı, doğma dilinə, millətinə sevgi, sadiqlik, hörmət, cəsarət, hünər, vicdanlılıq kimi keyfiyyətlərin aşılanması ən vacib məsələ hesab olunur.

**İstifadə edilmiş ədəbiyyat**

1. Paşayev Ə., Rüstəmov F. (2012). Pedaqogika. Bakı, Elm və təhsil. 463 s.
2. Tusi N. (1989). Əxlaqi-nasiri. Bakı, Elm. 279 s.
3. İsmayılov R., Nurullayeva Ü. (2021). Azərbaycan dili (2-ci sinif). Müəllim üçün metodik vəsait. Bakı, Radius MMC. 224 s.
4. Xəlilov Z. (2018). Azərbaycan dili (3-cü sinif). Dərslik. Bakı, Altun Kitab. 208 s.
5. Qaragözova N. (2018). Azərbaycan dili (3-cü sinif). Müəllim üçün metodik vəsait. Bakı, Altun Kitab. 232 s.
6. İsmayılov R., Abdullayeva S. (2019). Azərbaycan dili (4-cü sinif). Müəllim üçün metodik vəsait. Bakı, ASPOLİQRAF LTD. 240 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 73 – 82
doi.org/10.48445/e2209-8393-2573-y

**Ə D Ə B İ   M Ü H İ T**

# "Nadireyi zəmanə" – Mirzə Kəminə Tahirzadə (mühiti və şəxsiyyəti haqqında)

***Minaxanım Nuriyeva Təkləli***
Filologiya elmləri doktoru, professor, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: proftomris@gmail.com
https://orcid.org/0000-0002-4985-8134

**XÜLASƏ**
Məqalədə XIX əsr Azərbaycan ədəbiyyatının görkəmli simalarından olan Fatma xanım Kəminənin yaşadığı dövr, ədəbi mühiti, həyat və yaradıcılığı üzərində aparılan müşahidələr əsasında müəyyən nəticələr əldə olunmuşdur. Bu dövrdə şeir dilinin aydınlığı, canlılığı daha qabarıq formada hiss olunan keyfiyyətə çevrilmişdi. Artıq klassik ədəbi janrlar güclü təkamül prosesi keçir, bədii dil əvvəlki dövrlərdən fərqlənən yeni inkişaf məcrasına düşürdü. Şairin yaradıcılığında real həyatdan götürülən bədii təsvir və ifadə vasitələrinə təsadüf olunurdu ki, bu cəhət XIX əsr Azərbaycan lirik şeirində həyatiliyə, realizmə olan meylin gücləndiyini göstərirdi.

**AÇAR SÖZLƏR**
Kəminə, Natəvan, Qarabağ, şeir, bədii yaradıcılıq

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 13.10.2024
Qəbul edilib: 19.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 73 – 82
doi.org/10.48445/e2209-8393-2573-y

LITERARY ENVIRONMENT

# “Nadireyi Zamana” – Mirza Kamina Tahirzade (About Environment and Personality)

***Minakhanim Nuriyeva Tekleli***
Doctor of Philological Sciences, Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: proftomris@gmail.com
https://orcid/org//0000-0002-4985-8134

**ABSTRACT**
In the article, certain results were obtained based on the observations made on the period, literary environment, life and creativity of Fatma Khanum Kamina, one of the outstanding figures of the 19th century Azerbaijani literature. In this period, the clarity and liveliness of the language of poetry became a more noticeable quality. Classic literary genres are already undergoing a strong evolutionary process, the artistic language has entered a new course of development that is different from previous times. In the poet's work, there were artistic images and means of expression taken from real life, which indicated the strengthening of the trend towards vitality and realism in the 19th century Azerbaijani lyric poetry.

**KEYWORDS**
Kamina, Natavan, Karabakh, poetry, artistic creativity

**ARTICLE HISTORY**
Received: 13.10.2024
Accepted: 19.11.2024

## Giriş

XIX əsr Azərbaycan ədəbiyyatının görkəmli simalarından olan Fatma xanım Kəminənin ulu babaları Cənubi Azərbaycanın Sərab şəhərindən idilər. Bu soykökün ulu əcdadı Məhəmməd Tahir bəy olmuşdur. Sonralar ailənin Qarabağda “Tahirzadə” soyadı ilə tanınması da məhz bununla bağlı idi. Məhəmməd Tahir bəy Sərab vilayətinin Gərmərud mahalında anadan olmuşdur. Sonradan onun törəmələri Qarabağa gəlmiş, Şuşa şəhərində, Cavanşir mahalının Kəngərli və Qapanlı kəndlərində yerləşmişdilər. Bu qərib ailə çox keçmir ki, Şuşanın kübar, nüfuzlu ailələrindən biri kimi şöhrət tapır və Azərbaycan xalqına yeni ziyalı nəsil bəxş edir. Fatma xanım Kəminə 1841-ci ildə Şuşanın Mərdinli məhəlləsində yaşayan və bütün Qarabağda “Fani” təxəllüsü ilə tanınan şeir aşiqi Ağamirzə Bəybabanın ailəsində Sovet hakimiyyəti illərində əllərindən alınıb xəstəxanaya çevrilən malikanələrində dünyaya göz açmışdır. O, dünyaya gələndə Xanzadə Ağabəyim ağa doqquz il idi ki, qürbətdə Qarabağ həsrəti ilə uyuyurdu. Həmin ocaqda – Şuşada doqquz yaşlı Xan qızı – gələcəyin Natəvanı böyüyürdü.

## Əsas hissə

“Fani” təxəllüsü ilə şeirlər yazan Fatma xanım Kəminənin atası Ağamirzə Bəybaba Əliyar oğlu (1787 – 1867) Qarabağ xanı İbrahim xanın oğlu və vəliəhdi Məhəmməd Həsən ağanın katibi idi. O, Qasım bəy Zakirin, Mirzə Fətəli Axundovun müasiri və yaxın dostu, eyni zamanda maraqlı müsahibi idi. Zakir Axundova yazdığı “Gözüm yolda qaldı, könül intizar” mətləli məşhur məktubunda Bəybabanın adını çəkir:

Tək yaradıb səni vahidi-yekta,
Əxlaqına, ətvarına mərhəba!
Neyləmisən Molla Səfi, Bəybaba
Məmnundu, əzizim, bu qədər səndən?

Yuxarıda deyilənlərlə əlaqədar ədəbiyyat tariximizdə baş verən məlum bir hadisəni yada salaq. Bildiyimiz kimi, Qasım bəy Zakir qardaşı oğlu Behbud bəyin qaçaqçılığına görə çar hökuməti tərəfindən cəzalandırılaraq ailəsi ilə bərabər Bakıya sürgün edilmişdi. Bu böyük şairə dövlətə qarşı təhlükə mənbəyi kimi oğlu və qardaşı oğulları ilə birlikdə Sibirə sürgün cəzası kəsilmişdi. Şairin mal-dövləti talan olunsa da, Sibir sürgünü Mirzə Fətəlinin və Tiflisdəki digər nüfuzlu dostlarının köməkliyi ilə üç-dörd aylıq Bakı sürgünü ilə əvəzlənmişdi. Odur ki şair Qarabağa döndükdən sonra Mirzə Fətəliyə nəzmlə yazdığı məktublarında bununla bağlı öz razılığını bildirirdi. Çox

güman ki, Bəybaba ilə birlikdə adı çəkilən XIX əsrin digər şeir həvəslisi, deyildiyinə görə Qarabağda baməzə kimi tanınan Molla Səfi Zakirin dostlarından olan Mirzə Fətəliyə yazdığı digər məşhur "Xəbər alsan bu vilanın əhvalın..." naməsindəki şəxsdir.

Əgər xəbər alsan Molla Səfini,
Oğru dürüst qarışdırıb kefini,
O, Qalada biçər ölü kəfəni,
Çöldə üç atını soyublar çılpaq.

Göründüyü kimi, bir çox Qarabağlı şairlər kimi Zakirin dostu və müsahibi olan Bəybaba da, Molla Səfi də Mirzə Fətəliyə yaxın dost olmuş, onun hər zaman hal-əhval tutduğu, ünsiyyət saxladığı yerli ziyalılar arasında yer almışlar.

Kəminə Qarabulağın Saracıq kəndinin bəyi Sadıq bəy Mirzeynal oğlu ilə ailə qurmuş və bu izdivacdan onların beş övladı – Əşrəf və Rəşid bəy adlı iki oğlu, Tutu, Humay və Qumru adlı üç qızı dünyaya gəlmişdir. Onların hər iki oğlu, həmçinin Qumru xanımdan olan nəvələri Halay, Gəray və Adışirin bəy hərbçi idilər. ADR-in gənc zabitləri Halay və Adışirin 1920-ci ilin martında ermənilərin Əsgəran qalasında qaldırdığı qiyam zamanı baş verən döyüşdə həlak olmuşlar. Sonralar bu hadisəni böyüklərdən eşidən Şərifə xanım (Fatma xanımın nəticəsi) bildiklərini, eşitdiklərini belə nəql edirdi: *Anam Zöhrə xanım bu zaman yenicə gəlin köçmüş və Karyaginə (köhnə Qarabulaq eli, indiki Füzuli bölgəsi) atası evinə qonaq çağrılmışdı. Bu zaman babam Muxtar bəy (bildiyimə görə o zaman nahiyə rəisi işləyirmiş) evə ağlaya-ağlaya gəlib ermənilərin Əsgəranda qiyam qaldırdıqlarını və oğlanlarının həlak olma xəbərini gətirir və evdəki ziyafət yasa dönür. Erməni iğtişaşlarında və Qırmızı Ordu qüvvələrinin əlində malı-mülkü talan olmuş Muxtar bəy Muradov Azərbaycanın milli vətənpərvər ziyalılarının yetişməsində müstəsna rolu olan Qori Müəllimlər Seminariyasında Nəriman Nərimanovla birgə oxumuşdu. O, Mir Haşım Vəzirov, Əbdürrəhim bəy Haqverdiyev, Nəcəf bəy Vəzirovun müasiri və dostu olmuşdu. Dram əsərləri yazmağa böyük şövqü olan Muxtar bəy əsərlərinin əlyazmalarını "Azərnəşr"ə vermiş, lakin 1936-cı ildə ölümü ilə hər şey yarımçıq qalmışdı.*

Güney Azərbaycanın Sərab vilayətinin Gərmərud mahalından olan və sonradan Qarabağa yerləşən ulu babaları Məhəmməd Tahir bəydən soyadı götürən "Tahirzadələr", əsasən, Bakıda, ölkə xaricində o ocağa layiq ziyalılar yetirmişdir [6, s. 19]: Qafqaz müsəlmanları IV Şeyxülislamı Mirzə Həsən Tahirzadə, vaxtilə "Pravda" qəzetinin Azərbaycan üzrə xüsusi müxbiri işləmiş Leonid Tahirov, respublikamızın uzun illər Xarici İşlər naziri olmuş Tahirə Tahirova məhz Fatma xanım Kəminənin şəcərəsinə mənsubdurlar [5, s. 57].

Müasirlərinin fikrincə, Fatma xanım həm ana dilində, həm də fars dilində layiqincə təhsil almışdı. Ailə kökləri ilə İrana – Cənubi Azərbaycana bağlılığı, fars dilində yazdığı mükəmməl qəzəllər bunu sübut edir. Öz evlərində şairlə olan görüşünü xatırlayan Y. V. Çəmənzəminli yazırdı: “*O axşam yadımdadır, uzun-uzadı münaqişə oldu. Böyük qardaşım İran şahlarının əleyhinə danışır, Kəminə isə onları müdafiə edirdi* [1, s. 292].

Əzizə Cəfərzadə şairin müxtəlif cünglərdə və əlyazma kitablarında qorunmuş əsərlərini toplayaraq 1971-ci ildə “Gənclik” yayın evində nəşr etdirmişdir. Buna baxmayaraq, Fatma xanım Kəminə yaradıcılığına aid tədqiqatlara, demək olar ki, çox az sayda rast gəlinir. Məhəmmədəli Tərbiyət “Həqiqətüş-şüəra” əsərində Kəminəni yalnız bir cümlə ilə yad etmiş, onu “*mahir söz ustadı*” olaraq xatırlatmışdı [3, s. 86]. Firidun bəy Köçərli Qarabağın şair qızlarından Aşıq Pəri və Xurşidbanu Natəvanla yanaşı Kəminədən də bəhs edərək, *“Qarabağın üçüncü şaireyi-möhtəreməsi ismətməab Fatimə xanım “Kəminə” təxəllüsdür ki, səbiyyeyi-Mirzə Bəybaba vələdi-Əliyar bəydir”* deyə yazmışdı [2, s. 169].

Kəminədən bəhs edən təzkirəçilər, onunla ünsiyyətdə olan müasirləri bu qadının istər zahiri gözəlliyindən, istərsə də ismətindən, ağlından, əliaçıqlığından ağız dolusu danışmış, şeirlərinin bədii məziyyətlərindən bəhs etmişdilər. Əlbəttə, bunların içərisində böyük maarifçi-yazıçı Firidun bəy Köçərlinin şair haqqında fikirləri xüsusilə təsirlidir: “*Fatimə xanım həqiqətdə çox gözəl, zərif bir can idi və zahiri gözəlliyinə müvafiq batini və mənəvi tərəfdən dəxi əxlaqi-həsənə sahibəsi olub, ziyadə xoşxülq, mülayim və xoşrəftar bir nadireyi zəmanə idi”* [3, s. 173].

Fatma xanım yeniyetmə Yusif Vəzir Çəmənzəminlinin xatiratında da məhz bu cür qalmışdı: *Atamın vaxtilə çox qonaqlıq etmiş olduğunu anam sərzənişlə söylərdi. Mən yalnız son ziyafəti xatırlayıram, atam şairə Fatma xanım Kəminəni qonaq çağırmışdı. Kəminə çarşab örtər, lakin üzünü gizləməzdi, şairlər və ədəbiyyat maraqlıları onun evinə toplanardılar. Yadımdadır, bir xüsusiyyəti vardı: turş şeyləri çox sevirdi, atam bunu bilir və Ağdamdan bir-iki dəfə ona gülöyşə nar göndərmişdi* [1, s. 292]. Bəlkə, elə buna görədir ki, Natəvanın da şeir məclisində qonaqlara ilin hər bir fəslində verdiyi buz içində nar dənələri onun şeirlərində yer almışdır:

İnnab ləbin, cana, təşbih edib aşiqlər,
Nar danəsidir, guya, düşmüş buz arasında.

Fatimə xanımın vüqarlı, ünsiyyətcil, həm də kövrəkqəlbli bir insan olması haqqında olan xatirələrdən bu gün də söz açılır. Dildən-dilə keçən bir əhvalat isə onun ötkəmliyi, nadanlıqla barışmazlığından xəbər verir. Bir dəfə məscidin minarəsindən savadsız –

mollanın azan səsi gələr-gəlməz azanı düzgün çəkməyən naşı müəzzinin qələtlərinə dözə bilməyən Fatma xanım onu aşağı endirib məzəmmət etmişdi. "*Nənəm Fatma xanım haqqında ailəmizdəki söhbətlər qırıq-kəsik, ötəri olsalar da, hər dəfə onda diqqəti çəkən bir şey üzə çıxırdı. Eşitdiyimə görə çox qürurlu qadın sayılırmış; o məclisə girəndə kişilər ayağa durarmışlar (Müəllimim, Fatma xanımın nəticəsi Şərifə Sultanovanın mənə söylədiklərindən)*".

Fatma xanım uşaqlıqda da ağıllı, fərasətli qız kimi tanınıb. Sonralar şair kimi şöhrəti təkcə Qarabağa yox, bütün Azərbaycana yayılıb. Müasirlərinin "ərbabi-süxən", "Mirzə Kəminə", "nadireyi-zəmanə", "fəxrül-şüəra" adlandırdıqları Kəminənin ölümü ağır hüzn və təəssüflə qarşılanır. F. Köçərli onun vəfatını bütün Qarabağ şairləri və ürəfaları üçün yas hesab etmişdi.

Kəminə şeirlərini həm əruz, həm də heca vəznində yazırdı; əruz bəhrinin ətrini verən, hecanın əlvanlığını bəxş edən şeirlərində rast gəldiyimiz təşbeh, cinas, istiarə, mübaliğə və başqa obrazlı ifadələr onun klassik Şərq poeziyasına dərindən bələd olduğunu göstərir. Şairin bədii yaradıcılığının ideya-mövzu mənbələri, dil-üslub keyfiyyətləri, məcazlardan istifadə bacarığı onun əldə olunan irsinin öyrənilməsi məsuliyyətini bir daha artırır.

Cana, bu nə cadudur, qaşü-göz arasında,
Nitqim dutulur görgəc hərdəm, söz arasında.
Gər görsə Züleyxavu Yusif səni bəzmində,
Məbhut qalar billah, yüz bikr qız arasında.
İnnab ləbin, cana, təşbih edüb aşiqlər,
Nar danəsidir, guya, düşmüş buz arasında.
Ey dil, eyləmə, nalən yerinə yetdi
Saldın özün odlarə yandın köz arasında.

Müşahidələrə əsasən bu dövrdə şeir dilinin aydınlığının, canlılığının daha çox hiss olunduğunu söyləmək olar. Bu onun nəticəsidir ki, artıq bu zaman kəsiyində klassik ədəbi janrlar (qəzəl, qəsidə, rübai, müxəmməs) güclü təkamül prosesi keçir, bədii dil əvvəlki dövrlərdən fərqlənən yeni bir inkişaf məcrasına düşürdü.

Kəminə xanım (yaxınları ona şirin-şirin "Fatı xanım" deyərmişlər) Natəvanın yaxın rəfiqəsi, könül dostu olmuşdur. Bəzi şeirlərində onun Natəvana olan dostluq hissləri aydın şəkildə hiss olunur:

Tikib bu cild pürnəqşi nigarı, Natəvan, bəh-bəh!
Görsən nə bağ istə, nə gül axtar, nə dünya gəz!

– sözləri Natəvanın rəsm albomunda çəkdiyi şəkillərə olan vurğunluğunu ifadə edir. Lakin Natəvan “Məclisi-üns”ü təşkil edib yaşatsa da, Kəminə xanım bu məclisdə iştirak etməklə kifayətlənməyərək özü ayrıca, Mir Möhsün Nəvvabla birgə “Beytül-fəramuşan” dərnəyini yaratmış, ona rövnəq vermişdi. O zamanlar məclisin Kəminə ilə bərabər Abdulla bəy Asi, Mirzə Ələsgər Növrəs, Həsənəli xan Qaradaği, Məşədi Əyyub Baki, Məhəmmədəli bəy Məxfi kimi görkəmli üzvləri olmuşdur.

Bədii ifadə vasitələrini özünəməxsus ustalıqla işlədən Kəminənin şairanə məna tapıntıları onun hətta adi məişət məzmunlu şeirlərində, təbiət hadisələrinin təsvirində belə özünü büruzə verir. Kəminənin şeirlərində rast gəldiyimiz təşbeh, cinas, istiarə, mübaliğə və digər obrazlı ifadələr onun klassik Şərq poeziyasına dərindən bələd olduğunun göstəricisidir. Təbii gözəllikləri vəsf edən şair aşağıda nümunə göstərəcəyimiz məşhur qəzəlində də kamil bir tərzdə öz vəziyyətini təbiət ilə müqayisə edib dolğun, əyani nəticələr çıxara bilmişdir.

Pozuldu rövnəqi-gül, ətri-gülüstan getdi,
Saraldı gülləri, əl çəkdi bağiban getdi.
Durubdu sərv, əgər, bağin içrə müstəhkəm,
Diriğ, sərvi-rəvan getdi, əlaman, getdi.
Nə qoydu dəhrdə bir kam alub murada yetəm,
Nə aldı canımı qurtardı, cansitan getdi.
Çəməndə lal gəlib getdi dəhzəban susən,
Ki, çeşmi-nərgisi-məst oldu xunfəşan, getdi.
Nə qoydu xar ki, gül əndəlibə meyl etsin,
Nə əndəlib öz əhdində kamiran getdi.
Dönüb o əlif qəddi dalə bir gül hicrində,
Diriğ bülbül olub pir, o növcavan getdi.
Nihan olan qəmini faş qıldı mərdüm üçün,
Kəminə, dərdi-dilin oldu dasitan getdi.

*“Mirzə Fatimə xanımın qəzəlləri bir-birindən gözəldir!”* Bu, ədəbiyyatımızın fədaisi Firidun bəyin şairə verdiyi dəyərdir. Heca şirinliyi xanım şairin bağrından qopan acı tənələrin, gileylərin yanğılarını xəfiflədib onu bir hicran şərqisinə çevirir; onun belə şeirləri bu gün də ifaçılarımızın repertuarında yer almaqdadır.

Kəminə, ta əldən gedib görməzsən,
Ləzzət ilə bir də dövran sürməzsən.
Əhli-nəşə zümrəsinə girməzsən,

Kaş öləydim bu günləri görüncə.
Şikar olub əldən ələ düşməsin,
Qurulmuş torlara, felə düşməsin.
Yaman gözə, yaman dilə düşməsin,
Qan ağlaram o qürbətdə qalınca.

Həqiqətən, Fatma xanımın nəinki şeirlərinin, qoşmalarının, hətta qəzəllərinin belə dili canlı, çevik və şuxdur. Axı qəzəllərdə əsrlər boyu işlənən ənənəvi müqayisələr, təşbehlər və qəlib halını almış sözlər, ifadələr qəzəllərdən-qəzəllərə, dillərdən-dillərə köçürüldüyü, daşındığı halda bunun özünün nə kimi yenilik yarada bilməsi aydın deyilmi?

Xali-mişkinə baxın, arizi-canan düşüb,
Deyəsən, bir həbəşi səfheyi-İranə düşüb.
Mürği-dil daneyi-xalın görəli nalə çəkər,
Qisməti ruzi-əzəl ah ilə əfqanə düşüb.
Arizi-alidədir xali-siyahi, əlhəq,
Xətai-mişkin necə kim laleyi-nemanə düşüb.
Ey gözüm nuri, yüzündə bax o xali-siyahə,
Xəbər et mürği-dilə kim, odu bir danə düşüb.
Mürği-dil daneyi-xalın həvəsilə düşmüş,
Həlqeyi-zülfə ki, zincirə çu divanə düşüb.
O kaman qaşə qoyub qəmzə oxun, türk yüzün,
Şəhrə aşub salıb, hər biri bir yanə düşüb.
Görəli dil səri-zülfini könül bənd oldu,
Misrdə Yusifi-Kənan necə zindanə düşüb.
Derimiş dilbər kim, könlü degil məndə müqim,
Dil dönüb qanə o gündən ki, bu böhtanə düşüb.
Nöqteyi-xalü- gözü- qaşı yığılmış niyə,
Dövrdə zülfü Kəminə kimi peykanə düşüb.

Şairin yaradıcılığında real həyatdan götürülən təsvir vasitələrinə və ifadə formalarına da təsadüf olunur ki, bu cəhət XIX əsr Azərbaycan lirik şeirində həyatiliyə, realizmə olan meylin gücləndiyini göstərirdi.

Ey gözüm, Əhmədə bax, gör nə gözəl oğlandır,
Qəmi-hicrində onun qəmli könül virandır...

Bu qəbil şeirlərində həyatı və gözəlliyi təbliğ edən Kəminə sanki bir o qədər də uzun olmayan ömründən sonrakı fanilikləri də görə bilirdi.

Şairin bir vaxt zərbaftalı, saçaqlı boğçalarda daşınan, ortalıqda itib batan zəngin irsi olub. Çünki Mir Möhsün Nəvvab və Firidun bəy Köçərlinin məlumatlarına görə, *“Kəminənin təxminən dörd-beş yüz əfradü-şerü, qəzəli vardır”.* Məhəmməd ağa Muctəhidzadə “Riyazul aşigin” kitabında Kəminə haqqında *“pərdeyi-iffət və iffətdə məsturə olan bu mələksima”*nın böyük divanı olduğunu və bu divanı şəxsən gördüyünü yazır [4, s. 175 – 176]. Lakin bu gün o divan haqqında heç bir məlumat yoxdur.

Əldə etdiyim yeni tapıntılarımla iyirmi beş il bundan əvvəl Kəminənin həyat və yaradıcılığı haqqında geniş bir məqalə yazdım. Bu işdə mənə Kəminənin nəvə-nəticələri də kömək etdilər. Əlimdə şairin indiyə qədər heç yerdə nəşr olunmayan rəssam Əzim Əzimzadənin ailəsində qorunub saxlanmış bir həcvi vardı. Kəminə bu həcvi ona əbəs yerə aşiq olan bir gəncəli bəyzadəyə həsr etmişdi. Bununla əlaqədar şairin qəzəllərini ilk dəfə toplayıb nəşr etdirən professor Əzizə Cəfərzadə ilə əlaqə saxladım. Əzizə xanımın da bu barədə məlumatı var idi, amma həcv olduğu üçün içərisində sərt sözlərin çoxluq təşkil etdiyi bu şeirin aşiqanə qəzəllərlə bir sırada çap olunmasını münasib görməmişdi. Lakin illər sonra o şeirləri çap etdirib oxucuların ixtiyarına buraxdım.

**Nəticə**

Kəminənin dünyaya gəlməsindən 180, ölümündən isə 100 ildən artıq vaxt keçməkdədir. Yada salaq ki, bir vaxtlar Qarabağın səmada parlayan, gecəsini öz nuruyla səhərə döndərən üç ulduzu – Aşıq Pəri, Xurşidbanu Natəvan, Fatma xanım Kəminəsi var idi. Kəminənin həyat və yaradıcılığı yetərincə araşdırılmasa da, şeirlərinin canı, ruhu şairin həyat sevgisindən qidalanırdı. Bu həyatilik və xəlqilik, şair təfəkkürünün genişliyi onun şeirlərinin mündəricəsinin zənginliyini təmin edə bilmişdir. Bu keyfiyyətlər – şeir dilinin canlılığı, obrazlılığı, mükəmməlliyi, bədii təsvir vasitələrinin rəngarəngliyi sayəsində xalq ruhuna daim yaxın olmuşdur. Lakin Kəminə bəxti dönük sənətkar olmuşdur. Tədqiqatçılar sanki xəsislik edərək onun yaradıcılığı haqqında bir neçə cümlə yazmaqla kifayətlənmişlər. Şair haqqında yeganə bitkin, dolğun, ədalətli rəyi Firidun bəy Köçərli vermişdir.

Son olaraq qeyd edim ki, diqqətlə topladığımız faktlar əsasında yazılan bu məqalənin XIX əsr ədəbiyyat tariximizlə maraqlanan araşdırmaçılar, habelə oxucularımız üçün maraqlı olacağına ümid edirəm.

**İstifadə edilmiş ədəbiyyat**

1. Çəmənzəminli Y. V. (1966). Həyatımın 20 ili. Üç cilddə, II c. Bakı, Azərnəşr. 644 s.
2. Köçərli F. (2005). Azərbaycan ədəbiyyatı. İki cilddə. Bakı, "Avrasiya Press" nəşriyyatı. 557 s.
3. Tərbiyət M. Ə. (1987). Danişməndani-Azərbaycan. Bakı, "Azərbaycan" nəşriyyatı. 460 s.
4. Müctəhidzadə M. (1995). Riyazül-aşiqin. Bakı, "Azərbaycan" nəşriyyatı.
5. Cəfərzadə Ə. (1971). Fatma xanım Kəminə. Bakı, "Gənclik" nəşriyyatı. 100 s.
6. Çingizoğlu Ə. (2007). Tahirovlar. "Soy" jurnalı, № 1. Bakı, s. 18 – 25.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 83 – 92
doi.org/10.48445/u8831-1305-7050-o

**ƏDƏBİ MÜHİT**

# Mirzə Fətəli Axundzadənin maarifçilik ideyaları

***Pərixanım Soltanqızı (Hüseynova)***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Ədəbiyyatın tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: huseynovaperixanim1962@gmail.com
https//orcid.org/0000-0001-9391-6162

**XÜLASƏ**
Məqalədə Mirzə Fətəli Axundzadənin maarifçilik ideyaları araşdırılır. Bu məqsədlə ədibin bədii yaradıcılığı tədqiqatın əsas obyektinə çevrilir, şeirlərinin poetik xüsusiyyətlərinə elmi nəzər salınır, həmçinin poeziyada məzmun və formanın vəhdətdə olması fikrinə elmi münasibət bildirilir. Tədqiqatçı "Aldanmış kəvakib" və digər əsərlərində ədibin maarifçi realist baxışlarını araşdırır, dünyagörüşündəki ziddiyyətlərə diqqəti cəlb edir, əsərlərini mövzu və ideya baxımından şərh edərək obrazları elmi təhlilə çəkir. Tədqiqat işində Azərbaycan dramaturgiyasının yaradıcısı kimi diqqət önünə çəkilərək, ədibin Azərbaycan ədəbiyyatı tarixində və inkişafındakı xidmətləri yüksək dəyərləndirilir, komediyaları elmi cəhətdən tədqiq edilir. Ədibin yaşadığı dövrlə bağlı feodal-patriarxal eybəcərliklərin komediyalarında təsviri, onlara tənqidi münasibəti, köhnəliklə yeniliyin mübarizəsi, həmçinin maarifçilik ideyalarının təbliği araşdırılır, tədqiqatçının bütün bu məsələlərə elmi münasibəti bildirilir. Müəllif rəy və mülahizələrini sitatlar üzərində aparır, polemikaya yer ayırır.

**AÇAR SÖZLƏR**
nəsr, dramaturgiya, komediya, humanizm, maarifçilik, mövzu, ideya

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 25.09.2024
Qəbul edilib: 07.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 83 – 92
doi.org/10.48445/u8831-1305-7050-o

LITERARY ENVIRONMENT

# Enlightenment Ideas of Mirza Fatali Akhundzade

***Parikhanim Soltangizi (Huseynova)***
Doctor of Philosophy in Philology, Assosiate Professor, Department of Literature Teaching Technology, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: huseynovaperixanim1962@gmail.com
https//orcid.org/0000-0001-9391-6162

**ABSTRACT**
The article examines Mirza Fatali Akhundzade's ideas of enlightenment. For this purpose, the artistic creativity of the writer becomes the main object of research. The poetic features of his poems are examined scientifically. A scientific attitude is expressed to the idea that the content and the decree are in unity in poetry. Interpreting prose works in terms of themes and ideas, he draws images into scientific analysis. In the study, M. F. Akhundov is highlighted as the creator of Azerbaijani drama and his services in the history and development of Azerbaijani literature are highly valued. Comedies are scientifically studied. The description of the feudal patriarchal deformities in the comedies of the period in which the writer lived, his critical attitude to them, the struggle of the old and the new, and the promotion of the ideas of enlightenment are investigated. The scientific attitude of the researcher to all these issues is reported. The author makes his opinions and considerations based on quotations, leaving space for polemics.

**KEYWORDS**
prose, drama, comedy, humanism, enlightenment, theme, idea

**ARTICLE HISTORY**
Received: 25.09.2024
Accepted: 07.11.2024

## Giriş

M. F. Axundzadə XIX əsrin II yarısında maarifçi realizmin yaradıcısı, nəzəriyyəçisi və onun inkişafında böyük xidmətləri olan dühadır. O, Azərbaycan dramaturgiyasının banisi, bütün həyatını xalqının maariflənməsi, inkişafı yolunda fəda edən ictimai xadim, Azərbaycan ədəbiyyatı tarixində xüsusi əhəmiyyətli rolu və dərin izi olan sənətkardır.

Mirzə Fətəli anasının əmisi Axund Ələsgər ağanın köməkliyi ilə Tiflisdə dövlət qulluğunda işə düzəlir. Əvvəl Qafqazın baş hakimi Baron Rozenin dəftərxanasında mülki hissə üzrə şərq dilləri mütərciminin şagirdi, sonra isə həmin şöbənin mütərcimi vəzifəsində çalışır. Beş dili mükəmməl bilən Axundzadədən çar hökuməti tək mütərcim kimi deyil, dövlət əhəmiyyətli və siyasi-diplomatik işlərdə də yararlanır (Vaxtilə həmin vəzifədə Azərbaycanın görkəmli şairi, alimi A. A. Bakıxanov da fəaliyyət göstərmişdir.).

Tiflis mühitinin ədibin ədəbi fikri və inkişafında, mütərəqqi, maarifçi ideyalarının formalaşmasında əhəmiyyətli rolu olur. O, bir müddət Tiflis qəza məktəbində Azərbaycan və fars dilləri müəllimi işləyir (1836 – 1840). Sonra öz yerinə müəllimi Mirzə Şəfi Vazehi məsləhət görür. Axundzadənin müəlliminə sonsuz məhəbbəti var idi. Onun ədəbi istiqamətində, formalaşmasında ustadının böyük rolu olmuşdur. Sənətkar vəsiyyətində də məhz onun yanında dəfn olunmağını istəmişdir.

## Əsas hissə

Mirzə Fətəli Axundzadə bədii yaradıcılığa şeirlə başlamışdır. O, şeirdə forma və məzmunun vəhdətdə olması prinsipini önə gətirərək, məzmun və ifadə gözəlliyini əsas şərt kimi irəli sürürdü. Məzmun gözəlliyinə malik olub, lakin forma gözəlliyi olmayan şeiriyyətə Mollayi-Ruminin "Məsnəvi"sini nümunə göstərərək onu nəzmdə məqbul, lakin şeiriyyətində nöqsanlı olduğunu vurğulayır. İfadə gözəlliyi olub, məzmun gözəlliyi olmayan şeiriyyətə tehranlı Qaaninin şeirlərini misal gətirərək deyir: "Zəif və kəsalət aparıcı nəzmdir, amma yenə şeir növündədir, yenə də hünərdir".

Ədib XIX əsr İran şairi Süruşun şeirlərində müəyyən məzmun və ona uyğun forma olduğunu söyləsə də, onlarda nə ifadə, nə də məzmun gözəlliyinin olması fikrini bildirir. Hər iki gözəlliyə (məzmun və ifadəyə) malik şeir növünə "Şahnamə"ni (Firdovsi), "Xəmsə"ni (N. Gəncəvi), "Divan"ı (Hafiz) nümunə göstərərək nəşəli, aparıcı və həyəcanlandırıcı olduğu üçün oxucular tərəfindən elmi-ədəbi baxımdan bəyənildiyini əsaslandırır [4, s. 18; 170; 171].

Mirzə Fətəli Axundzadənin "Dövrandan şikayət" məsnəvisi, Puşkinin ölümünə həsr etdiyi "Şərq poeması", "Əbdülrəsul xana" həcvi, "Onların təqlidi elmi bərbad etdi",

“Yenə ünsü-cin arasında bu nə qarışıqlıqdır” mənzumələri və s. şeiriyyəti mövcuddur. Ədib “Dövrandan şikayət”də mühitindən, vəfasızlıqdan, ədalətsizlikdən şikayətlənir. Şeirdə Tiflisin tərif olunması ədibin bu şəhəri sevib, onun həsrətini çəkməsini əks etdirir. Şeirin ikinci hissəsində Tiflisdə ömür sürən bir alim mədh edilir. “Şərq poeması”nda ədibin Puşkinin ölümündən doğan təəssüf, kədər hissi, çara nifrəti, şairə məhəbbəti, ona hiss və duyğuları ifadə olunur. Şair şeiri fars dilindən nəsrlə rus dilinə tərcümə edərək, onu rus yazıçısı İ. İ. Klementyevə verir. O da tərcümədə heç bir dəyişiklik etmədən şeiri “Moskovskiy nablyudatel” jurnalının redaksiyasına göndərir və şeir ilk dəfə olaraq jurnalın 11-ci nömrəsində dərc edilir. Şeirdə sənətkar Puşkini rus sənətkarları (Lomonosov, Derjavin, Karamzin) ilə müqayisə edir, Puşkinə üstünlük verərək onu əbədiləşdirir:

Ah, o dəmlər, a dostum, Lomonosov,
Ülvi bir gözəlliklə yazıb inci şeirlər.
Şeiriyyət dünyasını bəzəmişsə də, lakin
Puşkinin quş xəyalı olmuş o yerdə sakin.
Əgər şeir mülkünü Derjavin tutmuşsa da,
Puşkin cavan yaşında sahib olub bu ada.
Dərin, dibsiz göylərdən hakim yaranmış ona.
Ah, hələ Karamzinin o bilik badəsini,
Onun ümmanlar kimi dərin ifadəsini
Puşkin almış əlindən, içib yetirmiş sona...

“Zivər nə cəzadır sənə, ey dilbəri-Ziba” (müxəmməs), “Ali Paşa haqqında” (qəsidə), “Gördüm” (yarımçıq qəzəl), “Çeşmə” (kitabə), “Səidə xitab” və s. nümunələr sənətkarın Azərbaycan dilində köhnə və xalq şeiri üslubunda qələmə aldığı şeirləri sırasındadır.

M. F. Axundzadənin 1857-ci ildə qələmə aldığı “Aldanmış kəvakib” povesti özündən əvvəl, yəni XIX əsrin I yarısında yaranmış Azərbaycan bədii nəsrinin inkişafında, demokratizmin, maarifçiliyin yayılmasında, feodal mütləqiyyət üsuli-idarəsilə mübarizədə əhəmiyyətli rol oynadı.

Ədibin “Aldanmış Kəvakib” əsərini yazmasına səbəb İran tarixçisi Münşinin “Tarixi aləm-arayi-Abbasi” əsərində təsvir olunan tarixi bir hadisə olmuşdur. Həmin tarixi hadisədə göstərilir ki, “Şah Abbasın hakimiyyətinin yeddinci ilində sarayda münəccimlik vəzifəsində çalışan Mövlana Cəmaləddin Məhəmməd Yəzdi şaha xəbər verir ki, ulduzların toqquşması nəticəsində cəlal sahibi olan bir hökmdarın başına fəlakət gələcəkdir. Bu bədbəxtliyin İranda baş verəcəyi ehtimal olunduğuna görə,

münəccimbaşı belə məsləhət görür ki, hadisə gözlənilən günlərdə Şah Abbas öz razılığı ilə üç günlük hakimiyyətdən əl çəksin və bu cəzaya layiq olan adamı səltənət başında oturtsun. Qürə Qəzvin şəhərində sakin olan Yusif Sərraca düşür. Yusif Sərracın başına tac qoyurlar, şaha layiq paltar geyindirirlər. Əmirlərin və ordunun himayəsilə təntənəli surətdə onu saraya gətirirlər. Şah isə öz yaxın adamları və xidmətçiləri ilə xəlvət bir guşəyə çəkilir. Üç gün keçdikdən sonra əvvəlki şah hökmranlığa qayıdır və Yusifin taxtı tabuta dönür".

M. F. Axundzadə bu tarixi hadisədən ədəbi priyom kimi istifadə edərək tarixi həqiqəti əsərin əsas ideyasına çevirmiş və bu hadisə əsərin süjetini, ana xəttini təşkil etmişdir. Ədib tarixi hadisəni zamanına uyğunlaşdıraraq müasirləşdirmiş, tarixin dili ilə danışmış, dövrünü keçmişin aynasında əks etdirmişdir.

Sənətkarın ifşa obyekti Şah Abbas, saray əyanları və onların çirkab dolu əməlləri, cinayətləridir. Münəccimbaşı Sədrəddin, Mollabaşı Axund Səməd, rüşvəti qanuniləşdirən vəzir Mirzə Möhsün, onun ən yaxın adamı, ikiüzlü, yaltaq, xəyanətkar, xəbis, rüşvətxor Müstövfi Mirzə Yəhya, bacarıqsız ordu başçısı Sərdar Zaman – hər biri xarakterik səciyyəsi ilə seçilən tipik obrazlardır. Sərdar Zaman Osmanlı qoşunlarının İrana keçməməsi üçün onların qarşısını almağı yolları dağıtmaqda, körpüləri uçurtmaqda, kəndlilərin taxıllarını, xırda və iribuynuzlu heyvanlarını məhv etməkdə görür. Özünü vətənpərvər göstərən ordu başçısı bu kimi "islahatları" ilə guya vətəni müdafiə edir. Müəllif onun yaltaq simasını, şərəfsizliyini özünü şahın astanasının "qoca iti" adlandırmaqla öz nitqilə ifşa edir.

Mollabaşı Axund Səmədin xisləti fitnə-fəsadla doludur. O, saray və xalq arasında şəriət və peyğəmbərin adından istifadə edərək millət, məzhəb, təriqət sünni-şiə davalarına səbəb olur. Axund Səməd əsərdə mənfi xüsusiyyətlərilə iyrənc təsvir olunan digər obrazları da özündə birləşdirərək tipik obraz səviyyəsində səciyyələndirilir. Onun əlində şəriət bir silah vasitəsidir. Bu yolla düşmənindən qisas almağa çalışsa da, bəzən məqsədinə nail ola bilmir. Əsərdə münəccimbaşı Sədrəddin Mollabaşının fitnə-fəsadından xilas olur, lakin Yusif Sərrac onun qurbanına çevrilir. Niyə? Müəllif bunun səbəblərini əsərdə incə şəkildə, bədii detallarla, obrazların simasında, baş verən hadisələrdə önə gətirir.

**Yusif Sərrac obrazı.** Mirzə Fətəli Axundzadə bu obrazı ideyalarının təbliğatçısı, ictimai görüşlərinin ifadəçisi və idealı kimi seçmişdir. Ona görə də Yusif Sərrac zəhmətkeş, yeni fikirli, ağıllı, bacarıqlı, xalqını, vətənini sevən, ədalətli, ruhanilərin düşməni olan bir obraz, bir qurbandır. Heç gözləmədiyi bir halda şahlıq taxtına əyləşmək, İran dövlətini yönəltmək onu bir tərəfdən nə qədər heyrətləndirib sarsıdırsa, özünü itirməyərək bir o qədər də bu vəzifədən yararlanır. Şah seçildiyi üç gün müddə-

tində illərlə həsrətində olduğu işləri, ideyalarını həyata keçirir; islahatlar aparır, xəstəxanalar, məktəblər açır, vergilərin miqdarını azaldır, dağıdılmış yolları bərpa edir, dini vergiləri ləğv edir, su olmayan yerlərə su çəkdirir, dullara, yetim-yesirlərə, şikəstlərə ianə verir, himayəyə götürür və s. Ən əsası odur ki, əhali bu üç gündə hər gün şaqqalanan, gözləri çıxarılan, dar ağacından asılan insanları görmür.

**Şah Abbas obrazı.** Yusif Sərracla müqayisədə bu surət hakimi mütləq, zalım, Yusif Sərrac isə xalqın sadiq və fədakar xadimidir. Yusif Sərracın faciəsinə səbəb Axundzadənin ictimai görüşlərindəki ziddiyyətdir. O, sinifli cəmiyyətdə siniflərin mübarizəsini görmürdü. Çünki sinifli cəmiyyətin hərəkətverici qüvvəsi siniflərin mübarizəsi idi. O elə hesab edirdi ki, Yusif Sərrac kimi humanist bir insanı hökmdar taxtında oturtması ilə dövrünün quruluşundakı ziddiyyətlər həll olunacaq. Cəmiyyət inqilabi çevrilişlə yox, islahat yolu ilə dəyişəcək. Yəni bir-birinə əks olan ədalətli və ədalətsiz hökmdarların əvəzlənməsi ilə...

Şah Abbas kimdir? Xalqını, dövlətini düşünməyən, ölkəsinin inkişafına çalışmayan, zalım, əhalisini daim vahimə altında saxlayan, həbslər, edamlar, müxtəlif cəza üsulları ilə onların ağzına kilid vuran, vəhşi vərdişlərini, davranışlarını görənlərin gözünü çıxardan, özünü öyənlərin dilini kəsən, şah meydanlarında baş kəsdirib, qan tökdürən bir cəllad. Taxt-tacı uğrunda öz soyunu – Səfəvilərin kökünü kəsən, oğlunun birini boğmaqla qətlə yetirən, digərinin gözlərini çıxardan cəllad ata.

Dramaturqun ilk komediya əsəri olan "Hekayəti-Molla İbrahimxəlil kimyagər"i (1850) yazmaqda əsas məqsədlərindən biri orta əsr əlkimya sxolastikasını ifşa etmək idi. Bu dövrdə sxolastikanın geniş yayılmasından istifadə edən iksir yolu ilə gümüş qayıranlar ruhani cildinə girərək müştərilərini aldadır və bu yolla varlanırdılar. Mirzə Fətəli Axundzadə bir-birinə qarışan pul hərisliyinə, dini etiqada, ümumiyyətlə, Şərq sxolastikasına qarşı mübarizəyə buradan başlamış, "Kimyagər"də patriarxal münasibətlərin tipik mənzərəsini yaratmış, kəskin tənqid etmişdir. "Sxolastika dinin məhsulu idi, Şərqdə yüksək elmi nailiyyətlərlə bir sırada sxolastika da geniş surətdə yayılmışdır. Mirzə Fətəli Axundov 60 – 70-ci illərdə fəlsəfi ictimai-siyasi məzmunlu əsərlərində Şərq sxolastikasına qarşı barışmaz mübarizə aparmışdır" [5, s. 205].

"Hekayəti Müsyö Jordan həkimi-nəbatat və dərviş Məstəli şah cadükuni- məşhur" (1850) komediyası da köhnəliklə yenilik arasında gedən mübarizəni əks etdirir. Burada yeni həyata can atan Şahbaz bəy, yeniliyi təqdir edən isə Hətəmxan ağadır. Yeni həyatın təbliğatçısı Avropadan gəlmiş həkimi-nəbatat Müsyö Jordan, köhnə həyatın təmsilçisi isə İrandan gəlmiş dərviş Məstəli şahdır. Onun dəstəkçiləri mövhumatın əsiri olan qadınlardır. Əsərdəki qadınlar onun toruna düşüb öz arzularının qurbanına çevrilirlər. "Avam və sadəlövh qadınlar dərvişin cadusuna inanmaqda tərəddüd etmirlər. Cadugər

onların gözündə bütün problemi həll edən, hər kəsi öz arzu və mətləbinə çatdıran ilahi bir qüvvədir" [1, s. 320]. Qadınları Məstəli şahın ətrafında birləşdirən səbəb Hətəmxan ağanın qızı Şərəfnisənin Şahbaz bəyə olan eşqi, onun Parisdəki açıq-saçıq qızların toruna düşüb onu unutması qorxusudur.

M. F. Axundzadə yaradıcılıq qüdrəti ilə oxucunun bütün diqqətini köhnəliklə yeniliyin mübarizəsinə, bu məsələlərin açılmasına yönəldərək hədəflərini ifşaedici üsulla tənqid atəşinə tutur.

Şərəfnisə Müsyö Jordanın nəcib, xeyirxah insan olduğunu söyləyir. Bu, reallıqda da belədir. O, gənclərin sevgisinə hörmətlə yanaşır. Şahbazı Parisə ona görə aparmaq istəyir ki, fransız dilini öyrənsin, elmli, məlumatlı olsun, Avropa təhsili alsın, yeni bir həyata qədəm qoysun, Azərbaycanın təbii sərvətini tədqiq edən alim kimi yetişsin. Bu işdə isə ilkin olaraq özünün Şahbaz bəylə məşğul olacağını söyləyir. Müəllif bu obraz vasitəsilə Azərbaycanın təbii nemətlərinin gözəlliyindən bəhs edir. Hər bir dərdə əlac olan möcüzəli otların Alp dağlarında, Amerikada, Afrikada yetişdiyini söyləyən fransız alimlərinin adlarını çəkir (Linney və Turnefort Bertram). Lakin onların əksinə olaraq, Azərbaycanın təbii sərvətləri olan bu otların, bitkilərin Azərbaycanda – Qarabağın dağlarında bitdiyini söyləyəcəyini və təbliğ edəcəyini bildirir.

Dramaturq Məstəli şah obrazını təsadüfi seçməmişdir. Xüsusən də köhnə dünyadan, mövhumatın məkanı olan İrandan gəlmiş Məstəli şahdan orta əsr feodal geriliyini, avamlığı, cəhaləti göstərmək, ifşa etmək üçün istifadə etmişdir. Yazıçı onun "Parisi dağıtmaq" oyununun təsadüfən Fransa inqilabının (1848) baş verməsi ilə üst-üstə düşməsini mövhumata inancın səbəbi kimi qiymətləndirir.

Şahbaz bəy də Şərəfnisəni sevir, onun məhəbbətinə sadiqdir. Lakin onun Fransaya, Avropaya getmək, təhsil almaq, oranın mədəniyyətini görmək eşqi şəxsi sevgisindən üstündür. O, ağılla sevir, müasirliyə can atır, oxumağı, sonra sevgi ilə ailə qurmağı düşünür. Şahbaz bəy bu düşüncəsi ilə XIX əsrin II yarısında Azərbaycan ədəbiyyatında yeni obraz səviyyəsinə qədər yüksəlir.

Ədib ananın, qızın və Xanpərinin simasında qonaqpərvər, xeyirxah, nəcib keyfiyyətlərə malik müsəlman qadınının multikultural, tolerant obrazını yaratmışdır. Məstəli şah Şahbaz bəyin Fransaya getməməsi üçün bir neçə cadu planını həyata keçirmək istəyəndə, məsələn, Şahbaz bəyin canına cin yeritmək, başından Parisi çıxarmaq üçün Fransanı alt-üst etmək, Müsyö Jordanın boynunu vurmaq məsələlərində onlar Məstəli şahla razılaşmırlar:

**Məstəli şah.** Bu surətdə gərəkdir ki, divlərə, ifritələrə əmr edim ki, Pariji xarab etsinlər, altını üstünə çevirsinlər ki, Şahbaz bəy dəxi ora getmək niyyətindən düşsün, yainki Mərrix ulduzuna hökm edim ki, Müsyö Jordanın boynunu vursun ki, Şahbaz

bəyi aparan olmasın. Bu işin bundan başqa çarəsi yoxdur.

**Şəhrəbanu xanım.** Bu necə mümkün şeydir, baba dərviş, belə iş eləmək olarmı? [2, s. 59]

Şəhrəbanu ilə Xanpərinin Məstəli şahın “oyununun” başqa şəhərlərə təsirindən, bu şəhərləri dağıtmasından narahatlıqları, təşvişə düşmələri onları mərhəmətli, insanpərvər, bəşəri duyğulara malik bir azərbaycanlı qadın kimi səciyyələndirir.

“Sərgüzəşti-vəziri-xani-Lənkəran” (1850) komediyadasında ailə ilə siyasi səhnələri birləşdirən Teymur ağadır. Müəllif onu daim inkişafda təsvir edir. Əsərin sonunda Teymur ağanın ağıllı, tədbirli bir xan obrazında görünməsi Axundzadənin maarifçi-realist dünyagörüşündəki inkişafından irəli gəlmişdir.

“Hekayəti-xırsi quldurbasan” (1852) məişət mövzusunda yazılmış komediyadır. Əsərdə real insan münasibətlərini, tipik həyatı, ictimai məsələləri əks etdirən bədii lövhələr verilir. Yazıçı Bayramla Pərzad arasında olan təmiz, real, saf sevgiyə mane olan Tarverdinin simasında əmioğlu və əmiqızının anadangəlmə göbəkkəsdisi kimi keçmişdən qalmış adət-ənənələri tənqid edir, hələ də davam etməkdə olan “qalıqların” acı nəticələrini göstərir. Onlara “ya vüsal, ya ölüm” deyən, iki gəncin sevgisini qarşı-qarşıya qoyur.

Maarifçi realist əsərdə digər iki məsələyə də toxunmuşdur: varlı-yoxsul təbəqələşməsi və kəndlilərin oyanışı.

M. F. Axundzadənin komediyaları sırasında, ümumiyyətlə, Azərbaycan ədəbiyyatında qələmə alınan komediyalar içərisində “Sərgüzəşti-mərdi-xəsis” (“Hacı Qara”, 1852) şah əsərdir. Müəllif pulun o dövr cəmiyyəti üçün əsas və çox güclü qüvvə olduğunu Hacı Qaranın dili ilə şərh edir:

“...Bu zəmanədə çox qoçaqlıqdan isə, ağrın alım, adamın cibi pul ilə dolu olsa yaxşıdır” [2, s. 132].

Hətta Heydər bəy keçmişi xatırlayaraq puldan ötrü döyüşə də getməyə hazırdır: “Pərvərdigara, bu necə əsrdir? Bu necə zəmanədir? Nə at çapmağın qiyməti var, nə tüfəng atmağın hörməti var! Sabahdan axşamadək, axşamdan sabahadək arvad kimi dustaq, alaçığın içində oturasan. Dövlət dəxi hardan olsun, pul hardan olsun? Ah, keçən günlər! Keçən dövrlər! Hər həftədə, hər ayda bir karvan çapmaq olurdu, bir ordu dağıtmaq olurdu. İndi nə karvan çapmaq olur, nə də ordu dağıtmaq olur” [2, s. 121].

Mirzə Fətəli Axundzadə dövrün hakim qüvvəsinə çevrilən pulun hökmran olduğu cəmiyyətin eybəcərliklərini Heydər bəyin qaçaq-quldurluq yoluna düşməsində, din adamı olan Xudaverdinin Hacı Qaranın qarşısında əyilərək yalan danışmasında, qaçaqçılıq yolu ilə mal əldə etməkdən qorxan, ailəsindən pul gizlədən Hacı Qaranın xəsisliyində və s. göstərərək kəskin tənqid edir.

Onu da qeyd edək ki, sənətkar hədəflərini göstərməklə, onları öz dilləri ilə ifşa edir. Bu, ədibin sənətkarlıq bacarığından irəli gələn xüsusiyyətdir. Obrazları öz nitqləri ilə ifşa etmək üsuluna XX əsrdə Mirzə Ələkbər Sabirin də yaradıcılığında rast gəlirik.

Professor Nadir Məmmədovun qeyd etdiyi kimi, “o, müəyyən bir sinfin, təbəqənin bədii surətini yaradarkən onu özünəməxsus bir üslubda danışdırmış, hər bir surətin nitqini onun öz həyat və düşüncə tərzinə, psixologiyasına, mədəni səviyyəsinə, ailədə və cəmiyyətdə tutduğu mövqeyə, düşdüyü şəraitə, söhbət etdiyi, müsahibə apardığı, mübarizə etdiyi adamlara uyğun bir tərzdə təbii və düzgün əks etdirmiş və realist ədəbiyyatın ən mühüm prinsiplərindən biri olan dildə tipikləşdirmə və fərdiləşdirməni məharətlə gözləmişdir” [2, s. 21].

Dramaturq burjuaziyanın cəmiyyətə gətirdiyi iyrənc əxlaqi normaları – xəyanəti, pula hərisliyi, tamahkarlığı, riyakarlığı əsas tipin, Hacı Qaranın simasında ən kəskin komik vasitələrlə tənqid atəşinə tutur. Bununla yanaşı multikultural dəyərləri, tolerantlığı erməni-müsəlman xalqları arasındakı əsrlərlə davam edən dostluqda göstərir, Arakel və Mkrıtıçın simasında əks etdirir. Naçalnik Heydər bəyi Sonanın zamininə verir. Onun göz yaşlarına qıymır, sevgilərini alqışlayır. Onları ayırmır. Sonaya tapşıraraq deyir: “Ondan yaxşı muğayət ol, genə pis bir iş tutmasın, ta yuxarıdan cavab gəlincə” [2, s. 157]. Bu detalda Axundzadə xalqlar arasındakı dostluğu siniflər arasında da təcəssüm etdirmişdir.

Komediyada Tükəz, Sona xanım ağıllı, xeyirxah, nəcib xüsusiyyətlərə malik Azərbaycan qadınının ümumiləşdirilmiş obrazlarıdır.

Tükəz kimi Sona xanım da göz yaşları tökərək nişanlısı Heydər bəyi tutduğu yoldan əl çəkməyə çağırır: “Əl çək. Bu işdən də əl çək! Mən atam evindən gətirdiyim cehiz ilə bir il yaxşı dolanarıq. Sonra bir yaxşı iş tapmasan, özün bil”. Toy zamanında da axan göz yaşlarında sevgilisi üçün narahatlıq var, hər an Heydər bəyin tutulması qorxusu var. Hər iki qadın ağıllıdır. Onlar yaxşı bilirlər ki, bu işin sonu ya ölüm, ya da qazamatdır, sürgündür.

Dramaturqun son komediya əsəri “Mürafiə vəkillərinin hekayəti”nin (1855) məzmununu feodal-patriarxal münasibətlər təşkil edir. Bu münasibətlər zəminində baş verən gülünc həyat həqiqətlərilə dolu əhvalatlar divana çıxarılaraq məhkəmə eybəcərlikləri, guya həqiqəti müdafiə edən vəkillərin tamahkarlığı, şəxsi mənafeləri, ədalətsiz davranışları ifşa olunur. Müəllif bu eybəcərliklərə qarşı mübarizə aparan yeni düşüncəli Səkinə xanım kimi qadın obrazını yaratmağı da unutmamışdır.

**Nəticə**

M. F. Axundzadə öz mütərəqqi, fəlsəfi düşüncələri, maarifçilik ideyaları və s. görüşləri ilə özündən əvvəl, habelə zəmanəsinin böyük fikir bahadırları səviyyəsinə yüksəlmiş, özündən sonrakı ədəbi inkişafa güclü təsir göstərmiş və göstərməkdədir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Qasımzadə F. (2017). XIX əsr Azərbaycan ədəbiyyatı. Bakı, Elm və təhsil. 552 s.
2. Axundzadə M. F. (2005). Əsərləri. Üç cilddə, I cild. Bakı, Şərq-Qərb. 296 s.
3. Axundzadə M. F. (2005). Əsərləri. Üç cilddə, II cild. Bakı, Şərq-Qərb. 378 s.
4. Axundzadə M. F. (1951). Əsərləri. II cild. Bakı.
5. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. (1966). Bakı, Azərbaycan SSR EA. 485 s.
6. Soltanqızı (Hüseynova) P. (2017). Azərbaycan ədəbiyyatı. Azərbaycan-Qazax ədəbi əlaqələri (Abay Kunanbayevin yaradıcılığı əsasında). Bakı, Elm və təhsil.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, № 4 (282), 93 – 99
doi.org/10.48445/n5911-0095-0616-g

ƏDƏBİ MÜHİT

# Elmi-nəzəri fikirdə Mirzə Ələkbər Sabir və Füzuli irsi probleminin tədqiqi məsələləri

***Ulduz Qəhrəmanova***
Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Ədəbiyyat kafedrası,
Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: ulduzkahraman1@gmail.com
https://orcid.org/0009-0003-4418-9319

**XÜLASƏ**
Mirzə Ələkbər Sabir istiqlal ideyalarını, əslində, bütün yaradıcılığı boyu izləmiş, bəzi əsərlərini birbaşa istiqlalın tərənnümünə həsr edərək azadlıq düşmənlərinin iç üzünü açmağa çalışmışdır. Bu cür mövzulara həsr edilmiş satiralarda o, Məhəmmad Füzuli əsərlərindən də bəhrələnmişdir. Çünki "füzulişünaslar" Sabirin düşmüş olduğu ilk ədəbi mühit idi. Şairin ustadı olan Seyid Əzim Şirvani də qəzəldə Füzuli yolunu davam etdirirdi. Sabirin şeir-sənət dünyasına qədəm qoyduğu ilk dövrlərdə ədəbi aləmdə Füzuli təsiri və poeziya ənənələri son dərəcə güclü idi. Demək olar ki, bütün şairlər özlərini onun şagirdi, davamçısı hesab edir və bundan böyük fərəh duyurdular. Cəfər Xəndan həmin şairləri "füzulişünaslar", yəni Füzuli davamçıları adlandırmış, S. Ə. Şirvanini isə, haqlı olaraq, qəzəldə "ən böyük füzulişünas" hesab etmişdir.

**AÇAR SÖZLƏR**
Füzuli irsi, Mirzə Ələkbər Sabir, poeziya, nəzirə, təqlid

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 13.10.2024
Qəbul edilib: 30.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 93 – 99
doi.org/10.48445/n5911-0095-0616-g

**LITERARY ENVIRONMENT**

# Research Issues of Mirza Alakbar Sabir and Fuzuli Heritance Problem in Scientific-Theoretical Thought

***Ulduz Gahramanova***
Doctor of Philosophy in Philology, Head Teacher, Department of Literature,
Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: ulduzkahraman1@gmail.com
https://orcid.org/0009-0003-4418-9319

**ABSTRACT**
Mirza Alakbar Sabir followed the ideas of independence, in fact, throughout his creative work, dedicated some of his works directly to the glorification of independence and tried to reveal the inner face of the enemies of freedom. In satires dedicated to such topics, he also benefited from the works of Mahammad Fuzuli. Because the first literary environment that Sabir fell into was the environment of "fuzulishunas". Seyid Azim Shirvani, who was Sabir's teacher, continued Fuzuli's path in ghazal. In the early days when Sabir entered the world of poetry and art, Fuzuli's influence and poetry traditions were extremely strong in the literary world. Almost all poets considered themselves Fuzuli's students and followers and were very proud of it. Jafar Khandan called those poets "fuzulishunas", i.e. followers of Fuzuli, He rightly considered S. A. Shirvani "the greatest fuzulishunas" in the ghazal.

**KEYWORDS**
Fuzuli heritage, Mirza Alakbar Sabir, poetry, vow, imitation

**ARTICLE HISTORY**
Received: 13.10.2024
Accepted: 30.11.2024

## Giriş

Mirzə Ələkbər Sabirin yaradıcılığının əsas məqsədi öz xalqının, ümumiyyətlə, türklərin və müsəlman aləminin istiqlala qovuşmasına mane olan əngəllərin müəyyənləşdirilib aradan qaldırılmasına kömək etməkdən ibarət idi. Ona görə də o, cəmiyyətin inkişafına, onun azadlığa və səadətə qovuşmasına maneçilik törədən bütün zümrə və insanları kəskin satira atəşinə tutub ifşa edir, eyni zamanda azadlığa, istiqbala gedən yolun çətinliklərini, onları gözləyən siyasi, hərbi və diplomatik təhlükələri nişan verməyə çalışırdı. Bu yolla o öz soydaşlarının və dindaşlarının azadlığa, istiqlaliyyətə yönələn yollarını qısaltmağa, həmin yolun asan keçilməsinə zəmin hazırlayırdı. Belə çətin və məsuliyyətli vəzifələrin uğurla həyata keçirilməsi üçün Sabir yenə klassiklərin ədəbi-tarixi təcrübələrindən sənətkarlıqla bəhrələnməyi əlverişli hesab edirdi.

## Əsas hissə

M. Ə. Sabir istiqlal ideyalarını, əslində, bütün yaradıcılığı boyu izləmişdir. Xüsusilə onun bəzi əsərləri birbaşa istiqlalın tərənnümünə − istiqlal düşmənlərinin iç üzünün açılmasına həsr edilmişdir. Bu cür mövzulara həsr edilmiş satiralarında o, M. Füzuli əsərlərindən də bəhrələnmişdir. Cəfər Xəndan yazırdı: "Azərbaycan ədəbiyyatı tarixində revolyusion satiranın banisi olan Sabir yaradıcılığının ilk dövründə bir sıra qəzəl yazmışdır. Azərbaycan klassik şeiri tarixində mühüm yer tutan qəzəl janrında şairlərimiz ən yaxşı lirik şeirlərini yaratmış və qəzəldə bədii ifadənin yüksək nümunələrini vermişlər:

Qəzəl de ki, məşhuri-dövran ola,
Oxumaq da, yazmaq da asan ola.

– deyən böyük Füzulinin qəzəlləri özündən sonrakı bütün şairləri öz təsiri altına almış, hamı onun kimi olmağa çalışmışdır. Sabirin düşmüş olduğu ilk ədəbi mühit həmin bu füzulişünaslar, onu izləyənlər mühiti idi. Sabirin müəllimi, ustadı olan Seyid Əzim Şirvani qəzəldə Füzuli yolunu davam etdirirdi. Onun qəzəlləri Sabiri ilk dəfə məşğul edən ədəbi, lirik parçalar olmuşdur" [6, s. 65].

Göründüyü kimi, professor C. Xəndan Sabirin klassik yazılı ədəbiyyatla əlaqəsi məsələsinə daha geniş planda baxmışdır. O, Sabirin poetik istedadına qida verən ədəbi mənbələri təkcə bir-iki şairlə, yaxud bir neçə şeir parçası ilə məhdudlaşdırmamış, həmin əlaqənin miqyasını, məzmununu geniş və daha əhatəli şəkildə götürmüşdür. Belə ki, Sabirin mühitini, həmin mühitin poetik ovqatını diqqət mərkəzinə gətirmişdir. İzah etmişdir ki, Sabirin şeir-sənət dünyasına hələ ilk qədəmlərini atdığı dövrdə ədəbi aləmdə M. Füzuli təsiri və poeziya ənənələri son dərəcə güclü idi.

Sabirşünaslıqda son dövrdə göstərildiyi kimi, Sabirin 1905-ci il rus inqilabına qədər ancaq qəzəl-qəsidə yazması, inqilabdan sonra isə birdən-birə satiraya keçməsi haqqında fikir elmi həqiqətə heç də uyğun deyil. Bu mövqeyin özündə bolşevizm ideologiyasının təsiri duyulur. Ona görə də sabirşünas professor Alxan Bayramoğlu bu mövqeyi elmi yanlışlıq hesab edir. O, qeyd etdiyimiz mövqeyə etiraz edərək yazmışdır: "Birtərəfli istiqamətdə aparılan tədqiqatların gəldiyi nəticələr çox zaman özünü elmi cəhətdən doğrulda bilmir. Çünki yaradıcılıq heç də həmişə monoton inkişaf etmir. İctimai həyatın, demək olar ki, bütün sahələrinə nüfuz edən, həyatı keşməkeşlərlə dolu olan Sabir kimi sənətkarın yaradıcılığı da həyatın özü kimi rəngarəng, enişli-yoxuşludur. Tədqiqatlar göstərir ki, Sabir inqilabdan sonra lap elə 1910-cu ildə də qəzəl yazmışdır. "Viranə Şamaxidə mənə gənc tapılmaz" misrası ilə başlayan qəzəl fikrimizə sübutdur" [1, s. 338].

M. Füzuli və M. Ə. Sabir mövzusuna konkret olaraq 1960-cı illərdə geniş toxunulmuşdur. Bunlardan mərhum professorlar Mirzəağa Quluzadə, Əkrəm Cəfər, Əziz Şərif və başqa alimlərin adlarını çəkə bilərik. Bu alimlər özlərinin elmi araşdırmalarında, əsasən, M. Ə. Sabirin M. Füzulinin və digər klassiklərin əsərlərinə yazdığı bənzətmə, nəzirə, parodiyalardan müqayisə yolu ilə bəhs etmişlər. Professor Tofiq Hacıyevin 1980-ci ildə çap etdirdiyi "Sabir: qaynaqlar və sələflər" monoqrafiyasında isə bu məsələyə bir qədər fərqli şəkildə yanaşılmışdır. Burada Sabirin öz ustadlarından təkcə poeziya və sənət dərslərindən deyil, həm də fikir və düşüncə baxımından bəhrələndiyindən geniş şəkildə bəhs edilmişdir. Adlarını çəkdiyimiz müəlliflərdən professor M. Quluzadənin 1962-ci ildə çap etdirdiyi məqalə "Sabir və Füzuli irsi" adlanır [8, s. 157 – 172]. Müəllif əvvəlcə problemlə bağlı ona qədər fikir söyləyən həmkarlarının – Ə. Mirəhmədovun, C. Xəndanın, A. Zamanovun düşüncələrini nəzərdən keçirib onlara qiymət vermiş, daha sonra M. Ə. Sabirin Füzuli irsində özünü göstərən tənqidi motivlərdən, yalançı din xadimlərinə bəslədiyi mənfi münasibətlərdən yaradıcılıqla bəhrələnməsinin forma və üsullarından bəhs etmişdir. O bu zaman böyük Azərbaycan şairinin "Rindü-Zahid", "Ənüsül-qəlb" və "Şikayətnamə" əsərinə, bir sıra qəzəllərinə istinadən öz fikirlərini əsaslandırmışdır. Alim öz fikirlərini ümumiləşdirərkən, haqlı olaraq, yazmışdır: "Gətirdiyimiz misallar da qətiyyətlə göstərir ki, Sabir Azərbaycan klassik şeirinə mükəmməl bələd olmuş, lakin onunla qənaətlənməyib irəliyə doğru getmiş, özünə yeni yaradıcılıq yolu tapmışdır. Böyük xalq şairinin Füzuli ənənələrinə əsl yaradıcı münasibəti də qəzəllərində deyil, realist inqilabi satiralarında özünü göstərmişdir ki, XX əsr ədəbi inkişaf üçün bu cəhət xüsusilə əhəmiyyətlidir" [12, s. 164].

M. Ə. Sabirin M. Füzuli irsinə yaradıcı münasibətinin orijinal nəticələrindən danı-

şarkən sabirşünas professor Məmməd Məmmədov 1974-cü ildə çap etdirdiyi "Sabir və mətbuat" monoqrafiyasında onu "Füzuli irsinin həqiqi varisi... və yeni şəraitdə onun ənənələrini yaradıcı şəkildə davam etdirən" şair kimi təqdim etmişdir [10, s. 45]. Alim həmin fikri 1990-cı ildə çap etdirdiyi "Sabir: mübahisələr, həqiqətlər" monoqrafiyasında da təkrar etmişdir [9, s. 105 – 106].

Mövzu ilə bağlı 1960-cı illərdə görkəmli qələm sahiblərindən prof. Mir Cəlal Paşayev, Əziz Mirəhmədov, Əziz Şərif, Əkrəm Cəfər, Kamil Mir Bağırov, akad. Mirzə İbrahimov, prof. F. Fərhadov, dosent İmran Babayev və b. özlərinin tədqiqatlarında Mirzə Ələkbər Sabir realizminin klassik irslə əlaqəsi məsələlərindən də bəhs etmişlər. Onlardan İ. Babayev "Füzuli ənənələrinin davamı haqqında" adlı tədqiqatında Füzuli və Sabir problemindən də bəhs etmiş, M. İbrahimov "Böyük şairimiz Sabir" adlı kitabçasında şairin klassik irslə əlaqəsi məsələsindən danışmışdır [3, s. 109 – 122]. O, Sabir sənətini Nizami, Nəsimi, Füzuli irsi ilə bərabər tutaraq onu həm mənəvi, həm ideya-estetik mündəricə baxımından, həm də mövzu və surətlər aləminin zənginliyinə görə hər bir tədqiqatçıya yetərincə material verən bir xəzinə adlandırır [7, s. 15]. Müəllif fikrinə davam edərək yazır: "Sabir də Nizami, Nəsimi, Füzuli kimi bu cür sənətin, böyük ümumiləşdirmə qüvvəsinə və fəlsəfi dərinliyə malik olan sənətin nümayəndəsidir" [7, s. 16].

Filologiya elmləri doktoru Yaqub Babayev "Sabir və klassik poeziya" məqalə-tədqiqatında isə şairin ayrı-ayrı sələflərinin poetik irslərinə müraciətinin bəzi konkret nümunələrini təhlil etmişdir [4, s. 413 – 428]. Müəllif göstərir ki, Sabirin klassik poeziyaya bağlılığından danışarkən iki Sabiri ciddi şəkildə bir-birindən fərqləndirmək lazım gəlir [2, s. 413].

Y. Babayev, birinci Sabir deyəndə füzuliyanə qəzəllər müəllifini, ikinci Sabir deyəndə isə inqilabi satira banisini nəzərdə tutur. Sonra o, Sabirin "Ey annın ay..." qəzəlini nəzərdə tutaraq fikrini belə tamamlayır: "Sənətkarın (M. Ə. Sabirin – U. Q.) cəmi dörd beytdən ibarət kiçik bir qəzəli vardır. Bu qəzəldə müəllif orta əsrlər Şərq şeirinə kəskin bir parodiya ilə cavab verir. Daha doğrusu, eyni janrda Şərq şairlərinin qəzəl və başqa janrlarda əsrlərcə vəsf etdiyi qəzəli məsxərə obyektinə çevirir..." [2, s. 417].

Bizə belə gəlir ki, burada Y. Babayevin fikri elmi baxımdan mübahisəlidir. Çünki yuxarıda göstərdiyimiz kimi, son dövr araşdırmaçılarından olan prof. A.Bayramoğluya görə, Sabirin əldə olunan qəzəllərinin əksəriyyəti 1905-ci ildən sonra yazılmışdır. Bundan başqa professor Mirzəağa Quluzadənin, haqlı olaraq, qeyd etdiyi kimi, Sabirin "Ey annın ay, üzün günəş, ey qaşların kəman" misrası ilə başlayan məşhur parodiyası heç də klassik qəzəl ədəbiyyatına deyil, XX əsrdə yeni inqilabi-demokratik mübarizələr şə-

raitində dövrün tələblərindən uzaqlaşaraq keçmişə qayıdan, köhnəlmiş, vaxtı keçmiş ədəbi formaları mexaniki surətdə, kor-koranə təkrar edən, ədəbi ənənələrə meymun kimi təqlidçi münasibət bəsləyən, realizmə zidd yol tutan qəzəl şairləri əleyhinə çevrilmişdir" [12, s. 170]. Yəni  bu nümunə orta əsrlər ədəbiyyatına deyil, bütövlükdə epiqon ədəbiyyatın tənqidinə həsr edilmişdir.

Elə bir qəzəl şairi tapılmaz ki, əvvəlki ustadlara – Nizami, Nəvai, Hafiz, Füzuli və başqalarına müraciət edib nəzirə yazmasın. Sabir isə nəzirəçilikdə belə öz orijinallığını qoruyub saxlayır. Onun nəzirələrinin, demək olar ki, hamısında əvvəlki əsər ya mahiyyət etibarı ilə rədd olunur, ya da məna, məzmun istiqamətini dəyişdirir" [5, s. 161].

Göründüyü kimi, alim öz fikirlərində hər bir sahədə olduğu kimi, Sabirin nəzirəçilikdə, klassik irsə münasibətdə də orijinal, təqliddən uzaq bir yol tutduğunu xüsusi olaraq nəzərə çatdırmışdır. Bu məsələdən bəhs edərkən professor Əziz Şərif yazırdı: "Hər xalqın tarixində olduğu kimi, bizim də tariximizdə şairlər müxtəlif olmuşdur. Bunlardan bəziləri (azları) şeirə yenilik gətirmiş, onun üzünə yeni yollar açmış, ona yeni ruh vermiş və şeir mədəniyyətini bir pillə yüksəltmişdir. Başqaları (çoxları) isə özlərindən qabaq yaşayıb yaradan şairlərin izi ilə getmiş, onlardan öyrənmiş, onlara şagird (bəzən çox istedadlı şagird) olmuş, onların yolunu davam etdirmiş, lakin özləri heç bir yenilik yaratmamış, yeni söz deməmiş, yeni yol açmamışlar" [13, s. 89].

**Nəticə**

Apardığımız təhlillərdən göründüyü kimi, M. Ə. Sabirin klassik irsdən bəhrələnmə üsulları çoxsahəli və rəngarəngdir. Bu məsələdən danışarkən professor Mirzəağa Quluzadə haqlı olaraq yazmışdır: "Sabir öz inqilabi-satirik ideyalarını daha parlaq ifadə etmək üçün Füzuli sənətini köməyə çağırır, düşmənlərinə daha sərrast, kəskin zərbələr vurmaq məqsədi ilə onun lirikasındakı kamil forma ünsürlərindən, büllurlaşmış bədii təsvir vasitələrindən istifadə edir; sanki düşmənləri əleyhinə döyüşə girmək üçün öz böyük sələfinin də cəbbəxanasından bəzi silahlar alır, Füzuli ilə müttəfiq olur. İstər bütün parodiyalar yaradarkən Füzulidən götürdüyü forma, bədii ifadə vasitələrində, istərsə də onun lirikasındakı bəzi ənənələri davam və inkişaf etdirdikdə Sabir bədii-ictimai fikir tarixinə yeni həqiqətlər, yeni surətlər gətirən novator sənətkar olaraq qalır. Onun bədii yaradıcılıq təcrübəsində klassik irsə, həmçinin Füzuli ənənələrinə müstəqil, yaradıcı münasibəti XX əsr Azərbaycan poeziya tarixində yeni mərhələ açması üçün də çox əhəmiyyətli olmuşdur".

Professor M. Quluzadənin Sabir və Füzuli münasibətləri haqqında dediyi bu qiymətli fikirləri bütünlüklə klassik irs və Sabir məsələsinə aid etmək olar. Çünki o

təkcə Füzuli irsinə yox, bütövlükdə klassik sənətkarların poetik irsinə yaradıcılıqla yanaşmış, mübarizə meydanında sələflərinin səsini məharətlə öz səsinə qatmışdır.

**İstifadə edilmiş ədəbiyyat**


1. Bayramoğlu A. (2010). "Bənzərəm bir qocaman dağa ki,. ". Bakı, Elm. 424 s.
2. Babayev Y. (2012). Sabir və klassik poeziya. M. Ə. Sabir haqqında tədqiqlər. Bakı, "CBS", s. 413 – 428.
3. Bağırov Ə. (1962). Satira dilinin böyük ustadı. S. M. Kirov adına Azərbaycan Dövlət Universiteti. İctimai elmlər seriyası, № 2, s. 37 – 45.
4. Cabbarlı C. (1949). Seçilmiş əsərləri. Bakı, Az SSR EA, s. 221 – 222.
5. Cəlal M. (1961). Sabir yaradıcılığında bədii sənətkarlıq. "Azərbaycan" jurnalı, № 12, s. 154 – 165.
6. Xəndan C. (1940). Sabir. Bakı, EA AzF. 166 s.
7. İbrahimov M. (1962). Böyük şairimiz Sabir. Bakı, Az SSR EA. 37 s.
8. Quluzadə M. (1962). Sabir və Füzuli. Sabir (Məqalələr məcmuəsi). Bakı, Az SSR EA, s. 157 – 172.
9. Məmmədov M. (1990). Sabir: mübahisələr, həqiqətlər. Bakı, Yazıçı. 276 s.
10. Məmmədov M. (1974). Sabir və mətbuat. Bakı, Elm. 214 s.
11. Paşayeva N. (1997). Sabir novatorluğu. Bakı, Mütərcim. 108 s.
12. Sabir (Məqalələr məcmuəsi). (1962). Bakı, Az SSR EA, s. 264 s.
13. Şərif Ə. (1962). Sabirin nəzirələri. "Azərbaycan" jurnalı, № 5, s. 89 – 96.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, №4 (282), 100 – 106
doi.org/10.48445/p6783-8564-2813-o

ƏDƏBİ MÜHİT

# Professor Əlövsət Abdullayev "Azərbaycan əlifbasının tarixi" haqqında

***Səbinə Muxtarova***
Doktorant, Bakı Dövlət Universiteti. Azərbaycan.
E-mail: sabina_mehdi1@mail.ru
https://orcid.org/0000-0002-1856-2648

**XÜLASƏ**
Professor Əlövsət Abdullayevin yaradıcılığında əlifba məsələsinin xüsusi yeri vardır. Alim ilk növbədə Azərbaycan əlifbasının tarixini araşdırmış və bu istiqamətdə ümumtürk əlifbaları haqqında da məlumat vermişdir. Onun tədqiqatlarına əsasən, məlum olur ki, türk xalqları Orxon-Yenisey, uyğur, soğdi, manixey, brahmi, ərəb, yunan, latın, kiril, alban əlifbalarından istifadə etmişlər. Müəllif bu əlifbalar haqqında müfəssəl məlumat vermişdir. Orxon-Yenisey abidələrinin yazıldığı əlifba milli yazıdır. Bu yazının mənşəyi barədə fərqli fikirlər mövcuddur; bəziləri onun kiril mənşəli, digərləri isə türk damğaları əsasında yarandığı fikrini müdafiə edirlər. Azərbaycanda V əsrin I rübündən VIII əsrə qədər alban əlifbasından istifadə edilmişdir. Azərbaycanda uzun dövr ərzində istifadə edilən yazı növü ərəb əlifbası olmuşdur. Bu əlifbaya qarşı Azərbaycan ziyalıları mübarizə aparmış, onun qüsurlarını göstərərək, bəziləri islah olunması, digərləri isə tamamilə dəyişdirilməsi fikrini irəli sürmüşlər. Nəhayət, alimin bəhs etdiyi sonuncu yeni yazı növü – latın əlifbasıdır. Müəllif məqalə boyu bu əlifba uğrunda görülən işlərdən, eyni zamanda onun üstünlüklərindən bəhs edir.

**AÇAR SÖZLƏR**
əlifba, Orxon-Yenisey, alban, ərəb, kiril, latın

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 06.10.2024
Qəbul edilib: 24.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 100 – 106
doi.org/10.48445/p6783-8564-2813-o

L I T E R A R Y   E N V I R O N M E N T

# Professor Alovsat Abdullayev "On the History of the Azerbaijani Alphabet"

***Sabina Mukhtarova***
Ph. D. student, Baku State University. Azerbaijan.
E-mail: sabina_mehdi1@mail.ru
https://orcid.org/0000-0002-1856-2648

**ABSTRACT**
The issue of the alphabet has a special place in the work of Professor Alovsat Abdullayev. First of all, the scientist investigated the history of the Azerbaijani alphabet and gave information about the all-Turkic alphabets in this direction. Based on his research, it is known that the Turkic peoples used the Orkhon-Yenisei, Uighur, Sogdian, Manichean, Brahmi, Arabic, Greek, Latin, Cyrillic, and Albanian alphabets. The author has given detailed information about these alphabets. The alphabet in which the Orkhon-Yenisei monuments are written is a national script. There are different opinions about the origin of this writing; some argue that it is of Cyrillic origin, while others argue that it was formed on the basis of Turkic symbols. The Albanian alphabet was used in Azerbaijan from the first quarter of the fifth century to the eighth century. The type of writing used in Azerbaijan for a long time was the Arabic alphabet. Azerbaijani intellectuals fought against this alphabet, pointing out its defects, some suggested its reformation, while others proposed its complete replacement. Finally, throughout the article, the author talks about the works done for the Latin alphabet, as well as its advantages.

**KEYWORDS**
alphabet,
the Orkhon-Yenisei,
Albanian, Arabic,
Cyrillic, Latin

**ARTICLE HISTORY**
Received: 06.10.2024
Accepted: 24.11.2024

**Giriş**

Professor Əlövsət Abdullayev yalnız dilçilik elminə dəyərli töhfələr bəxş etməmiş, həmçinin onu, yaradıcılığında milli təəssübkeşlik, türkçülük ideyalarının təbliği, türk xalqlarının, o cümlədən Azərbaycan xalqının taleyüklü məsələləri maraqlandırırdı.

**Əsas hissə**

Məlumdur ki, əlifba məsələsi, demək olar ki, xalqını sevən, onun inkişafı üçün çalışan hər bir ziyalını, mütəfəkkiri maraqlandırmış və bu sahədə hər kəs öz töhfəsini verməyə çalışmışdır. Bunu Azərbaycan ziyalılarının timsalında aydın şəkildə görmək olar. Əlifbanın sadə xalq kütlələri üçün kifayət qədər anlaşıqlı olmaması, yaxud müəyyən ictimai-siyasi səbəblərdən tez-tez dəyişdirilməsi xalqın mədəni inkişafına mənfi təsir göstərən amillərdəndir. Ona görə də ziyalılarımız əlifbanın dilimizin ruhuna uyğunlaşdırılması, yazıb-oxumanın asanlaşdırılması üçün bu sahədə islahatlar aparmağın zəruriliyini irəli sürmüş və bunun həyata keçirilməsi üçün çalışmışlar. Lakin ümumilikdə türk xalqları tarixində istifadə edilmiş əlifba və onların xarakter xüsusiyyətləri, çatışmayan və üstün cəhətləri barədə olan linqvistik araşdırmalar fərqli xarakter daşıyır. Ə. Abdullayevin adıçəkilən məqaləsi bu tarixi hadisəni təcəssüm etdirən dəyərli mənbədir.

Qeyd edək ki, bu məqalə və əlifba haqqında ilk müzakirə 1991-ci ildə Türkiyədə iki müxtəlif jurnalda çap olunmuş [4, s. 381 – 386; 5, s. 613 – 617], sonralar isə müəllifin 1992-ci ildə nəşr olunmuş "Azərbaycan dili məsələləri" kitabına daxil edilmişdir [6, s. 25 – 68].

Məqalə, əlifbanın insan zəkasının ən böyük möcüzələrindən biri olması fikri ilə başlayır. Müəllif türk xalqlarının tarixən bir neçə – Orxon-Yenisey, uyğur, soğdi, manixey, brahmi, ərəb, yunan, latın, kiril, alban əlifbalarından istifadə etdiyi barədə məlumat verir. Qeyd edilir ki, onların bəzilərindən öz əlifbaları kimi çox, bəzilərindən isə az istifadə edilmişdir. Müəllif məqalədə Orxon-Yenisey, ərəb, latın, rus əlifbalarının Azərbaycanda istifadəsindən ətraflı, alban əlifbasından istifadədən isə nisbətən az bəhs etmişdir. Sonralar M. Qıpçaq (Məmmədəli Dünyamalı oğlu Novruzov) "Türk əlifbaları" vəsaitində soqd, manixey əlifbaları və passe-pa yazısı barədə məlumat vermişdir [12, s. 36]. Bir neçə il sonra isə həmin müəllif "Türk yazısının tarixi" kitabında türklərin tarixən istifadə etdiyi Çin yazısı, Tibet əlifbası, Suriya əlifbası barədə ətraflı bəhs edir [13, s. 112].

Türklərin tarixən istifadə etdiyi milli yazı, əsasən, Orxon-Yenisey əlifbasıdır. Müəllif bu nəticəni qəti şəkildə qeyd edir ki, Orxon-Yenisey yazıları ta qədim

zamanlardan başlayaraq, türk dillərinin yazı ənənəsi olmuşdur. Bu fakt göytürklərin xüsusi əlifbaya malik olduğunu göstərir. Məqalədə bu yazılara bəzi Avropa ölkələrində, habelə Azərbaycanın Şamaxı, Naxçıvan ərazisində də rast gəlindiyi qeyd edilir.

Bəzi alimlərin, xüsusilə M. Erginin fikirlərinə görə, Orxon-Yenisey yazıları V – VIII əsrlərə aid olsa da, Orta Asiyada tapılan bəzi qədim run yazıları hətta eradan əvvəlki dövrlərə təsadüf edir. Qeyd edək ki, Orxon-Yenisey yazısının mənşəyi barədə fərqli fikirlər mövcuddur. Bəzi alimlər bunun aramey, finikiya əlifbası əsasında yarandığını, digərləri isə onun türk damğaları əsasında formalaşdığını göstərirlər. İkinci fikrin tərəfdarları çoxluq təşkil edir. Ə. Abdullayev bu fikirdədir ki, Orxon-Yenisey əlifbasının orijinal inkişaf xəttini tapmaq üçün yazının meydanagəlmə tarixini izləmək lazımdır. Müəllif güman edir ki, bu əlifba daha qədim dövrə aiddir və adı çəkilən əlifbalardan əvvəl yaranıb. Alim göstərir ki, Orxon-Yenisey yazısı türk dillərinin xüsusiyyətlərini əks etdirən ən yaxşı əlifbalardandır. Müəllif Orxon yazısının nisbətən sonrakı dövrə aid olduğu üçün daha təkmil olduğunu qeyd edir. Belə ki, Yenisey əlifbasında 150, Orxonda isə 38 işarə vardır; bunların dördü sait (1 – a, ə, e üçün; 2 – ı, i üçün; 3 – o, u üçün; 4 – ö, ü üçün), otuz dördü isə samitləri bildirirdi. Məqalədə sait və samitlərin yazılışı, onların istifadə xüsusiyyətləri barədə də məlumat verilir. Hətta bu yazıda ahəng qanununun gözlənildiyi də qeyd edilir. Q. Aydarov samitlərin ahəngindən bəhs edir və bunu saitlərlə əlaqələndirir [7, s. 13]. Bununla yanaşı bəzi yerlərdə bir hərfin yerinə başqasının yazılması dialekt xüsusiyyəti hesab edilir.

Ə. Abdullayev bəzi mənbələrə əsaslanaraq, Orxon-Yenisey əlifbasının həm də "Oğuz" əlifbası adlandırılması fikrini müdafiə edir. Bu fikrin sübutu üçün türk əlifbasından bəhs edən A. Sokolovdan əsaslı bir sitat gətirir. Maraqlıdır ki, S. Y. Malov da türk dillərinin bölgüsündə "Oğuz" sözünün qarşısında mötərizədə "qədim türk runik yazıları abidələrinin dili" ifadəsini yazır [14, s. 7]. Eyni zamanda Faruk Sümer də bu fikri təsdiq edir [15, s. 6]. O, Orxon-Yenisey əlifbasını Göytürk dövlətinin ilk milli əlifbası hesab edir [15, s. 18]. L. Ligeti Qafqazın da Göytürklərin hakimiyyəti altında olduğunu yazır [11, s. 199 – 201]. Bu isə həmin əlifbanın Azərbaycanda da yayıldığını təsdiqləyən faktlardandır.

Müəllifin növbəti bəhs etdiyi yazı növü alban əlifbasıdır. Eramızın V əsrinin I rübündə Qafqaz albanlarının əlifbası kimi yaranan bu yazı V – VIII əsrlərdə fəaliyyət göstərmişdir. Əlifba 52 hərfdən – 10 sait və 42 samitdən ibarət olmuşdur. Bu əlifba məktəblərdə tədris edilmiş, onunla elmi, dini və bədii əsərlər, hətta alban təqvimi yaradılmışdır. Bu da həmin əlifbanın geniş yayıldığının göstəricisidir. Bu əlifbanın müəyyən izləri günümüzə qədər gəlib çatmışdır. Belə ki, deyilənə görə, Eçmiədzində XV əsrə aid bir dərsliyə təsadüf edilmiş, Mingəçevirdə qazıntılar zamanı bu əlifba ilə

yazılmış kitabələr tapılmış, Dağıstanda isə bir daş üzərində bu əlifbanın siyahısı aşkarlanmışdır.

Azərbaycanda uzun müddət ərzində istifadə edilən yazı növü ərəb əlifbası olmuşdur. Azərbaycan xalqının tarixi taleyində mühüm rol oynayan bu əlifbadan Ə. Abdullayev ətraflı bəhs etmişdir. Məqalədə əlifbada olan hərflərin forması, istifadə qaydası, müsbət və mənfi cəhətləri, habelə sonradan edilmiş dəyişikliklər barədə geniş məlumat verilmişdir. Müəllif əlifbanın dilimizə uyğunsuzluğunun birinci səbəbini onun fonetik əlifba olmasında görürdü. S. Əlizadə yazır: "Ərəb əlifbası konsonant olmaqla türk dilləri (xüsusən Azərbaycan dili) üçün az əlverişlidir. Bu əlifba türk dillərində danışıq səslərinin keyfiyyət və kəmiyyətini dəqiq əks etdirməkdə acizdir" [10, s. 8 – 9]. Bu isə o deməkdir ki: 1) bir hərf bir neçə səsi ifadə edir; 2) bir səs bir neçə hərflə verilir; 3) nöqtələrdən çox istifadə edilir; 4) eyni hərf sözün ayrı-ayrı yerlərində müxtəlif cür yazılır; 5) sait səslər az olduğu halda, çox zaman samitin yanında yazılmır.

Göründüyü kimi, Ə. Abdullayev sistemli şəkildə ərəb yazısının dilimiz üçün çatışmayan cəhətlərini sadalamış və bunları konkret faktlarla şərh etmişdir. Dilçi professor məqalədə S. Əlizadənin, habelə görkəmli ədiblərimizdən Ö.F.Nemanzadənin, N. Nərimanovun, V. Xuluflunun, M. Şaxtaxtlının, M. F.Axundzadənin, F. Köçərlinin, Ə. Haqverdiyevin, B. Çobanzadənin və digərlərinin əlifbanın nöqsanları barədə fikirlərini bölüşür. Bu əlifbanın tarixindən danışarkən onun islahı ilə bağlı işlər xüsusilə diqqət çəkir. Belə ki, M. F. Axundovun, M. Şaxtaxtlının, S. Ağamalıoğlunun və başqalarının bu sahədə ardıcıl və inadlı fəaliyyətləri olmuşdur ki, məqalədə bunlar barədə məlumatlar verilmişdir. Müəllif təkcə azərbaycanlı mütəfəkkirlərin deyil, habelə Jan Deni, K.Volney və başqa xarici tədqiqatçıların da ərəb əlifbasının nöqsanları haqqında fikirlərinə öz məqaləsində müəyyən yer vermişdir. Ərəb əlifbasına qarşı olanların bu yazıya münasibəti də fərqli olmuşdur; bəziləri ərəb yazısını saxlamaq, lakin ciddi islahat aparmağı məsləhət görürdüsə, digərləri bu yazı növündən tamamilə imtina etməyi məqsədəuyğun hesab edirdilər.

Azərbaycanda iki dəfə (1929 – 1939 və 1991) latın əlifbasından istifadə edilmişdir. Ə. Abdullayev birinci əlifba haqqında fikirlərini, onun hazırlanıb həyata keçirilməsi üçün olan fəaliyyəti, görkəmli mütəfəkkirlərin müzakirədəki iştirakı və s. məsələləri məqalədə ətraflı şəkildə əks etdirmişdir. Həmçinin məqalədə ilk olaraq 1919-cu ildə Abdulla bəy Əfəndizadənin "Son türk əlifbası" adlı layihəsindən bəhs edilir. Burada olan hərflər morze və ərəb əlifbası ilə verilmişdir. Ə. Abdullayev buradakı latın əlifbasının nöqsanını göstərir; belə ki, *ı* hərfi *w* ilə, *ş* hərfi isə *ch* ilə verilmişdi. Sonralar latın əlifbası qəbul edilən zaman bu nöqsanlar aradan qaldırıldı. Ə. Abdullayev məqalədə yeni əlifbanın üstünlüklərini də ətraflı şərh edir. Onu da qeyd edək ki, keçmiş

SSRİ-də bir hərəkata çevrilən bu işin "pioneri" Azərbaycan idi, çünki məhz Azərbaycandan sonra digər xalqlar latın əlifbasına keçmişdi və bu əlifbaların əsasında unifikasiya üçün (vahid şəklə salınma) Azərbaycanda hazırlanmış əlifba dururdu.

Amma vahid SSRİ deyilən imperiyanın tərkibində bu hərəkətə yol vermək olmazdı. Çünki bu əlifba bir tərəfdən, SSRİ-dəki türkdilli xalqları Türkiyəyə yaxınlaşdırır, digər tərəfdən, rus dili ilə əlaqəni zəiflədirdi. Ona görə də 1940-cı il yanvarın 1-dən latın əlifbasından rus əlifbasına keçildi. Ə. Abdullayev bu əlifbanın dilimizin orfoqrafiyası üçün uyğunsuzluğunu faktlarla nəzərdən keçirir. Xüsusən dilimizdə olmayan və çətinlik yaradan, iki səsi birləşdirən hərflərin olması yazı işində böyük çətinliklər yaradırdı. 1958-ci il islahatından sonra xeyli yüngüllük yarandı. Bu islahatlar nəticəsində alimin dediyi kimi, "rus qrafikasına keçən başqa türk xalqlarının əlifbası ilə müqayisədə bizimki yenə də ən yaxşı əlifbalar sırasında" oldu [6, s. 62]. Professor buradakı üstünlükləri və çatışmazlıqları bir-bir sadalayır. Müəllif bu əlifbada apostrofun qalmasını nöqsan kimi qeyd edir. N.A.Baskakov yazır: "Əlifba dildə olan bütün səsləri mütləq əhatə etməli deyil; bundan ötrü xüsusi transkripsiya mövcuddur" [8, s. 58]. Ə. Abdullayev isə qeyd edir ki, ən ideal əlifba bütün səsləri ifadə edə bilməz. Apostrofun dilimizdə qalması 400-ə yaxın ərəb sözlərini düzgün tələffüz edə bilmək üçün idi, indi isə çox az belə söz qalıb. O sözlərə artıq vərdiş edilib və apostrofa ehtiyac yoxdur. Qeyd etmək lazımdır ki, hələ 1978-ci ildə F. Cəlilov "Ədəbiyyat və incəsənət" qəzetində bu məsələni ortaya atmış və sonradan alimlərimiz buna öz münasibətlərini bildirmişlər [9, s. 64 – 68]. Məlum olduğu kimi, nəticədə, apostrof əlifbamızdan çıxarıldı.

Məqalənin sonunda müəllif ümumtürk əlifbası barədə məlumat verir. Alim qeyd edir ki, bu əlifba türkdilli xalqları bir-birinə yaxınlaşdırar. Buna görə də 1991-ci il noyabrın 18 – 20-də İstanbulda Mərmərə Universitetinin Türkiyyat Araşdırmaları İnstitutunda əlifba ilə bağlı simpozium keçirir. Qeyd edək ki, Ə.Abdullayev bu simpozium barədə, habelə əlifba ilə bağlı türk dünyasında olan mübahisələr barədə mətbuatda məlumat vermişdir [1; 2; 3]. Məlumat verilir ki, simpozium ümumtürk əlifbasına keçidi alqışlayır və onun qəbul edilməsi üçün qərar verir. 34 işarədən ibarət olan bu əlifbanın 32-si bizə aiddir. Təbii ki, bu qərar mühüm tarixi əhəmiyyət daşıyır və professor digər türk xalqlarının da öz əlifbalarını buna uyğunlaşdırmasını arzulayır.

**Nəticə**

Professor Ə. Abdullayevin Azərbaycan əlifbasını tarixi aspektdə araşdırması əlifbaların bir-birini əvəz etməsinin xalqımızın tarixində oynadığı rola işıq salır. Müəllif bu prosesdə milli əlifbamızın olduğunu qürur hissi ilə qələmə alır və bununla

yanaşı latın əlifbasının dilimizə uyğunluğunu, elmi-nəzəri və praktik cəhətdən əhəmiyyətini, bu əsasda ümumtürk əlifbasının yaradılmasını coşqu ilə qeyd edir. Bu hal Ə. Abdullayevin təkcə Azərbaycan xalqının deyil, bütün türk dünyasının övladı olduğunu bir daha təsdiq edir.

**İstifadə edilmiş ədəbiyyat**


1. Abdullayev Ə. (1991, 14 may). Əlifba dartışması. “Aypara” qəzeti.
2. Abdullayev Ə. (1991, 28 may). Biz də bir şey başa düşürük. “Azərbaycan” qəzeti.
3. Abdullayev Ə. (1991, 9 dekabr). İstanbulda əlifba simpoziumu. “Bakı” qəzeti.
4. Abdullayev E. (1991). Azerbaycan alfabesi tarihinden. Fahir İz Armagani II. ABD, Harvard Üniversitesi, Cambridge, MA, s. 381 – 386.
5. Abdullayev E. (1991). Bizler də birşeylər anlıyoruz ama! “Alfabe meselesi” kitabı üzerine. “Türk kültürü” aylıq dergisi, № 342, s. 613 – 617.
6. Abdullayev Ə. (1992). Azərbaycan dili məsələləri. Bakı, Bakı Universiteti Nəşriyyatı. 329 s.
7. Aydarov G. (1966). Yazyk Orkhona pamyatnik Bil'ge Kaganu. Alma-Ata, Nauka. 92 s.
8. Baskakov N. A. (1980). Problema sovershenstvovaniya i unifikatsii alfavitov tyurkskikh literaturnykh yazykov SSSR. Problemy sovremennoy tyurkologii. Alma-Ata, s. 58.
9. Cəlilov F. (1978). Apostrofun yazı mədəniyyətimizə münasibəti. Bakı, “Ədəbiyyat və incəsənət” qəzeti. № 2, s. 64 – 68.
10. Əlizadə S. (1985). Orta əsrlərdə Azərbaycan yazı dili. Bakı, ADU Nəşriyyatı. 86 s.
11. Ligeti L. (1986). Bilinmeyen iç Asya. Ankara, Türk Tarih Kurumu Basımevi. 361 s.
12. Qıpçaq M. (2012). Türk əlifbaları (soqd, manixey əlifbaları və passe-pa yazısı). Bakı, “MBM” nəşriyyatı. 36 s.
13. Qıpçaq M. (2017). Türk yazısının tarixi (oçerklər). Bakı, “Ləman nəşriyyat poliqrafiya” MMC. 112 s.
14. Malov S. Ye. (1951). Pamyatniki drevnetyurkskoy pis'mennosti. Teksty i issledovaniya. 451 s.
15. Prof. Dr. Faruk Sümer. (1967). Oğuzlar (Türkmenler): tarihleri, boy teşkilatı, destanları. Ankara, Ankara Üniversitesi Basımevi. 522 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, №4 (282), 107 – 113
doi.org/10.48445/a0379-2338-2656-q

ƏDƏBİ MÜHİT

# Fakir Baykurt və İsa Muğannanın bədii yaradıcılığında ləqəblərin müqayisəli təhlili

***İlahə Kərimova***
Magistrant, Bakı Avrasiya Universiteti. Azərbaycan.
E-mail: ilahek2001@gmail.com
https://orcid.org/0009-0002-1369-3806

**XÜLASƏ**
Tarix boyunca insanlar ilk olaraq adlardan, daha sonra isə soyadlardan istifadə etmişlər. Son zamanlar isə ləqəblərdən daha çox istifadə edilməyə başlanmışdır. Ləqəblər sosial həyatın bir gerçəyidir. Bədii ədəbiyyatda ləqəblərdən üslubi məqsədlər, obrazın dünyagörüşü və digər xüsusiyyətlərini təsvir etmək üçün istifadə edilir. Türk və Azərbaycan yazıçılarının əsərlərində ləqəblərin geniş şəkildə işləndiyinin şahidi oluruq. Məqalədə məşhur türk yazıçısı Fakir Baykurtun bədii yaradıcılığına daxil olan romanlarla (“Onuncu köy”, “Tırpan”) İsa Muğannanın povestlərindəki (“Kollu koxa”, “Şəppəli”) ləqəblər müqayisəli şəkildə təhlilə cəlb edilmiş, Azərbaycan və türk dillərindəki ləqəblərin linqvistik və üslubi xüsusiyyətləri müqayisə olunmuşdur. Həm türk, həm də Azərbaycan dilində işlənən ləqəblər öz leksik-semantik çalarları baxımından bir-birindən fərqlənir. Bu ləqəblərdə personajın görünüşü, həmçinin fiziki və psixoloji cəhətləri əks olunur.

**AÇAR SÖZLƏR**
ləqəb, obraz, xüsusiyyət, müqayisəli təhlil

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 01.10.2024
Qəbul edilib: 12.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 107 – 113
doi.org/10.48445/a0379-2338-2656-q

LITERARY ENVIRONMENT

# Comparative Analysis of Nicknames in the Artistic Works of Fakir Baykurt and Isa Mughanna

***İlaha Karimova***
Master student, Baku Eurasian University. Azerbaijan.
E-mail: ilahek2001@gmail.com;
https://orcid.org/0009-0002-1369-3806

**ABSTRACT**
Throughout history, first people began to widely use first names, and then surnames. Nicknames have been used more recently. Nicknames are a fact of social life. Nicknames are also used in fiction for stylistic purposes, to describe a character's outlook and other characteristics. We witness the extensive use of nicknames in the works of Turkish and Azerbaijani writers. In the article, the novels ("Onunju koy", "Tirpan") included in the artistic work of Fakir Baykurt, one of the famous Turkish writers, and the nicknames in the stories of Isa Mughanna ("Kollu kokha", "Sheppali") are involved in a comparative analysis. Thus, in the article, we analyzed the linguistic and stylistic features of nicknames in the Azerbaijani and Turkish languages. Nicknames used in both Turkish and Azerbaijani languages differ in terms of their lexical-semantic nuances. These nicknames reflect the character's appearance, physical and psychological aspects.

**KEYWORDS**
nickname, image, feature, comparative analysis

**ARTICLE HISTORY**
Received: 01.10.2024
Accepted: 12.11.2024

## Giriş

Müasir dövrdə insanın cəmiyyətdə seçilməsinə xidmət edən eyniləşdirmə vasitələrinin cəmi kimi antroponimik kateqoriyalar rəsmi və qeyri-rəsmi olmaqla iki yerə bölünür. *Rəsmi antroponimik kateqoriyalara* soyad, ad və ata adı daxildir. İnsanın gündəlik həyatında mühüm yer tutan, qeyri-formal ünsiyyət vasitəsi kimi məişət üslubunda istifadə olunan, qeyri-rəsmi ad bildirən ləqəblər mühüm rola malikdir. Onlar real həyatda insana məxsus müəyyən bir əlamət və xüsusiyyətlərə görə meydana gəlir və yayılır. Şəxsin özünəxas xüsusiyyətini görən başqa şəxs onu müvafiq sözlərlə ifadə edir. Ləqəblər şəxsi həm həqiqi, həm də məcazi mənada xarakterizə edir. Bədii ədəbiyyatda isə ləqəblər yazıçının məqsədinə uyğun olaraq yaranır. *Ləqəb* – şəxsin əsl adına, o şəxsin fərdi əlamətlərinə – xarici görünüşü, peşə və sənəti, yaşadığı ərazi, sosial durumu, insanlara münasibəti və s. ilə bağlı insanlara həyatlarının müxtəlif dövrlərində bu və ya digər şəkildə verilən ikinci – əlavə, köməkçi adlardır. İnsanlar bu adlarla məhdud sahədə tanınırlar.

## Əsas hissə

Adqoyma və ləqəbvermə bütün cəmiyyətlərdə və mədəniyyətlərdə insanın yaranması ilə əlaqədar meydana gəlmişdir. İnsanlara adlar yaxın qohumlar tərəfindən verildiyi halda, ləqəblər dostlar və ya sosial çevrə tərəfindən qoyulur. Bu sonradan adlandırma bir tərəfdən insanın xarakterini, cəmiyyətdəki mövqeyini, gördüyü işi, ətrafı ilə münasibətini, etnik mənşəyini əks etdirsə də, digər tərəfdən ona bu ləqəbi verən insanların da xüsusiyyətlərini əks etdirir. Bəzi adlar və ləqəblər insanlara və cəmiyyətə yönəldilir, bəziləri isə mənfi mənalarda istifadə olunur.

Ləqəblər tədqiqata az cəlb olunmuş sahələrdən biridir. Bunun əsas səbəblərindən biri də onların qeyri-rəsmi ad olmasıdır. Ləqəblərin dil və ictimai mühit, onların tarixi inkişafı, insanlara xidmət edən ünsiyyətdə sabitliyi, antroponimik kateqoriyalar arasında rolu, funksional parametrləri, yaranma səbəbləri, üslubi xüsusiyyətləri və s. istiqamətlərində tədqiqatlar aparılmışdır.

Antroponimik kateqoriyalar sırasına daxil olan təxəllüsləri bəzən ləqəblərlə qarışdırırlar. Ləqəblər insanların tutduğu peşəyə, vəzifəyə, zahiri görkəmə və s. görə başqaları tərəfindən verilir. Təxəllüslər isə şəxslərin özləri tərəfindən qəbul edilir. Ləqəblər mürəkkəb adın komponenti kimi çıxış etməsinə baxmayaraq, əsasən, başqa dilə tərcümə olunur. Təxəllüslərdə isə bu xüsusiyyət yoxdur. Ləqəblərdə çoxmənalılıq xüsusiyyəti vardır. Elm və incəsənət xadimlərinin qəbul etdiyi təxəllüslər rəsmidir. Onlar dövlət tərəfindən qeydə alınır, qorunur, müstəqillik və toxunulmazlıq hüququnu daim saxlayır. Təxəllüslərə nümunə olaraq, Məhəmməd Füzulinin qəbul etdiyi *Füzuli*

(ərəbcə "həddini bilməyən", "həddini aşan", məcazi mənada "çox danışan", "çox bilən"), Mirzə Fətəli Axundzadənin *Səbuhi* (ərəbcə "səhərə mənsub", "sübhə aid"), Abbasqulu Ağa Bakıxanovun *Qüdsi* (ərəbcə "müqəddəs", "pak"), Abbas Səhhətin *Səhhət* ("sağlamlıq", "düzgünlük"), Abdulla Şaiqin *Şaiq* (ərəbcə "şövqlü", "həvəsli") təxəllüslərini misal göstərə bilərik.

Sənətkar ləqəb verəcəyi obrazın bir sıra xüsusiyyətlərini müəyyənləşdirir və ona müvafiq olaraq ləqəb tapır. Əzizə Mikayılova yazır: "Bədii əsərdə ideyanı qabarıq nəzərə çarpdırmaq üçün istifadə olunan üslubi vasitələrdən biri də ləqəblərdir" [6, s. 169].

Belə sənətkarlardan biri də Azərbaycan ədəbiyyatında özünəməxsus elmi və yaradıcılıq üslubu ilə seçilən İsa Hüseynovdur. Sənətkar ləqəbləri surətin xarakterinə uyğun verir və əsərin ideyasının rahat başa düşülməsinə kömək edir. İsa Hüseynovun yaradıcılığı ləqəbləri təhlil etmək üçün zəngin material verir. Yazıçı hələ ilk əsərlərində – hekayə və povestlərində insanın daxili aləmini, hiss və duyğularını göstərməyə meyil edirdi. Onun yaradıcılığında varislik, ideya ardıcıllığı, estetik meyar etalonu bir-birinə sıx şəkildə bağlıdır. Yazıçının əsərlərində qəhrəmanlar onları əhatə edən insanlara, daha doğrusu, onlarla birlikdə çalışanlara, ünsiyyətdə olan adamlara ləqəb verməklə bəzilərini təşvişə salır, çünki bu ləqəblər onların mövcud şəxsi ləyaqətlərini, ən çox da nöqsanlı cəhətlərini incə detallarına qədər ifadə edir. Obrazların bu hərəkətləri ləqəb verdiyi insanları təkamül etməyə məcbur edir.

Ləqəblərin bir hissəsində ortaq xüsusiyyətlər özünü göstərir. Bu cür ləqəblər, ən yaxın olduqları düşünülən qruplara daxil edilmişdir. Məqalədə məna xüsusiyyətlərinə görə qruplaşdırılan ləqəblər şəkli xüsusiyyətlərinə görə də qruplaşdırılmışdır. Ləqəblərin verilmə səbəbi bədii əsərlərdə hadisələrin gedişatında başa düşülür. Bədii ədəbiyyatdan götürülmüş nümunələrə nəzər salaq:

"Sübh yerindən qalxan tək Şəban gedərdi məscidə, oturardı qazının hücrəsində, günortayadək qazı ilə və qazının yanına gələnlərlə söhbət edərdi. Günorta gələrdi evə. Naharını yeyib gedərdi məscidə. Günü axşamadək məsciddə keçərdi. O səbəbdən də adını *Şeyx* Şaban qoymuşdular" [3, s. 190].

"Camaat ona *Yastı* Salman deyirdi. Çünki o hər şeyin dünyada hamar, yastı olmasını istəyirdi. Hər yerdə ata oğlunun ixtilafına qarışmaq, iki sevgilinin arasına girib onları barışdırmaq, ər ilə arvadın davasını yatırmaq, sədrin qəzəbinə gəlmiş adamların işini düzəltmək sanki Yastı Salmana peşə olmuşdu. "Yastı Salman" çağırılmağına da səbəb onun yalnız xasiyyəti deyildi. Xarici görkəmi də buna əsas verirdi. Təbiət onu qəribə yaratmışdı: enli üzü, yastı burnu, yastı dodaqları və yastı bədəni var idi. Gütüklü yastı əlləri, yastı qara qaşları var idi, çənəsi ləndə elə bil daşın altında qurud əzirdilər, yerişi

isə o qədər yastı idi ki, kənardan baxan onun yeridiyini, yaxud suda üzdüyünü birdən-birə ayırd edə bilməzdi” [5, s. 116].

“Altıncı tühəf – Rəhim kimi kişi idi. Adına *Pişik* Rəhim deyərdilər. Bu ləqəbin ona verilməyinin səbəbi o oldu ki, hər yerdə ki plov verərdilər, istər toy olsun, istər vay *Pişik* Rəhimi orada görərdin. Bu yerlərin hamısına da təklifsiz gedərdi. Hətta ehsana çağırılacaq adamların siyahısı tutulan vaxt bir nəfər Rəhimin adını çəkəndə deyərdilər ki, onu yazmaq lazım deyil, özü gələcək. Onun özündən xəbər alanda ki, Rəhim əmi, bu qonaqlıqlara çağırılmamış niyə gedirsən? Cavab verirdi ki, getməyəndə inciyərlər. Həmişə də mollalar ilə bir yerdə məclisin başında əyləşərdi” [3, s. 224].

Bu nümunələrin sayını istənilən qədər artırmaq olar. Bədii ədəbiyyatda və canlı xalq danışıq dilində ləqəblərin işlənmə məqamı belə bir tezis irəli sürməyə əsas verir ki, ləqəb antroponimik modeldə köməkçi xarakter daşısa da, o, şəxsin varlığının müəyyən əlamətini özündə əks etdirmək baxımından şəxs adından daha canlı səslənir.

Türk ədəbiyyatında “kənd romanı” anlayışı 1930-cu illərin sonundan işlənməyə başlamışdır. Fakir Baykurtun tədqiq olunan romanları onun *kənd romanları* silsiləsinə daxildir. Bu romanları təhlilə cəlb etməkdə əsas məqsəd ondan ibarətdir ki, kənd romanları cəmiyyət həyatına və folklora aid xüsusiyyətləri özündə ehtiva edir. Fakir Baykurt bir neçə il kənddə müəllim kimi fəaliyyət göstərmişdir. Onun romanları xalqın o dövrə aid yaşayış tərzini və s. özündə əks etdirir. Romanlarda qəhrəmanların bir qismi gerçək həyatda olduğu kimi ləqəblərlə adlandırılmışdır. Bu ləqəblər də müxtəlif xüsusiyyətlərə görə verilmişdir.

*Qəhrəmanların fiziki özəlliklərinə görə verilən ləqəblər*. Sosial həyatda insanların fiziki xüsusiyyətləri də nəzərə alınır. Bu xüsusiyyətlər insanların adını oxşar adlardan fərqləndirmək xüsusiyyətinə malikdir. Hər iki müəllifin əsərində ləqəblərin bu qrupuna aid nümunələr vardır.

Fakir Baykurtun “Irazcanın Dirliği” romanında qəhrəmanların fiziki özəlliklərinə görə ləqəblər verilmişdir: “Sultanca teyzesinin küçük gelini gelmiş. *Çivi* Esme orada” [1, s. 15]. “Rahmetlik *Kör* Kerim gibi lafı dolandırıp durma!..” [1, s. 39]. “Arkadaş, bana da *Çolak* Adil'in Mahmut derler!” [1, s. 158] Bu nümunələrin sayını istənilən qədər artırmaq olar.

İsa Muğannanın “Kollu Koxa” əsərində qəhrəmanların fiziki xüsusiyyətlərinə uyğun olan ləqəblərə rast gəlinir. “*Tülkü* Nəsib! *Bic* Bəbir!.. və s.” [7, s. 362].

Azərbaycan və türk dillərindəki ləqəblər öz semantikası baxımından bir-birindən fərqlənmirlər. Ləqəbləri quruluşuna görə *sadə, düzəltmə* və *mürəkkəb* olaraq qruplaşdıra bilərik.

İsa Muğannanın əsərlərində ləqəblərə diqqət yetirək.

**Sadə ləqəblər:**

1. "Öz yanında Zırpı deyirlər. Zırpı Şöşü, "*Dəli* Şöşü!" Çünki Ruqiyyəyə hamı "şikəst qız", "əyriçiyin" deyir, tək Şöşü "Gözəl Ruqiyyə" deyir!" [7, s. 246]
2. "Böyük Həmidin adını qoydular "*Qara* Həmid", Kiçik Həmidin adını qoydular "*Sarı* Həmid", ikisinə bir yerdə isə "qudurğan qardaşlar!" [8, s. 17]
3. "Molla müəllimin oğlu Ramazana "*Sıpa* Ramazan" deyirdilər" [7, s. 215].

**Düzəltmə ləqəblər:**

1. "*Dəmirçi* İsfəndiyar qul olmasa, belə zillət çəkərəmmi mən?!" [7, s. 33]
2. "Sonra məlum olmuşdu ki, Hacının, necə deyərlər, dünyadan xəbəri yoxdur, onun istədiyi qız, "Məhər" və ya "*çekist* Məhərrəm" deyilən məşhur bir adamın Orta kənd Tahirlidə olan böyük bacısı Pəri çoxdan alışıb-verişib" [7, s. 16].
3. "*Alverçi* Xeyrənin paslı dəhrəsinə ötəri baxıb, gündüzlər nəvələrinin oynadıqları küncə fırlandı, orda divardan asılı qoltuq ağacını götürüb qayıtdı" [7, s. 11].
4. "İndiyə qədər Qaracalarda bir kəsə güldən ağır bir kəlmə deməyən sakit, işgüzar Cavanşir – *Cəfalı* Cavanşir yoxa çıxmışdı" [7, s. 399].
5. "*Qorxaq tülkü* Ehsan nə özü qapımızı açır, nə də oğlunu qoyur gəlsin" [8, s. 22].
6. "Öz məlahətli səsilə sərkərlilərin könlünü oxşayan bir gəncin – *arabaçı* Qaranın elə bil birdən-birə səsi batmışdı" [8, s. 163].

**Mürəkkəb ləqəblər:**

1. "Bizim bir *Yekədiz* Məcidimiz var idi. Cavan oğlandı, amma elə nəhəngdi ki, lap əməlli-başlı div kimi. Xüsusən dizləri elə yekə idi ki, baxanda elə bilirdin ki, şalvarının altında hər dizinə bir yekə daş bağlayıb" [8, s. 386].
2. "*Meşəbəyi* Mirqasım yəhərdə çəpəki oturub, papağının dalını qaldırıb mahnı oxuyurdu" [8, s. 323].
3. Vərəqlərdə uzun bir siyahı vardı: "*Dingə* Dəmir, *Həsir* Haşım, *Xain* Xıdır, *Çənə* Bağır, *Təkayaq* Cəbiş..." [7, s. 393].

Fakir Baykurtun romanlarında ləqəblərə diqqət yetirək.

**Sadə ləqəblər:**

1. Bayram, babası *Koca* Şali'nin çifti kurtarınca böyle yaptığını, Irazcanın da bahşiş olarak bişi kızarttığın hatırladı [1, s. 9].
2. Kaymakamın kapısındaki jandarma, *Kara* Bayram'ın ne istediğini sordu [1, s. 95].
3. Arkadaş, bana da *Çolak* Adil'in Mahmut derler! Malamayı gösterdi: Doldur torbalarını! [1, s. 160]

**Düzəltmə ləqəblər:**

1. *Nüfusçu* Osman yerinden kalkıp Muhtara doğru geldi [1, s. 154].

2. *Ocakçı* Adem, su küpünün başında uyukluyordu [1, s. 154].
3. *Şekerci* Hakkı Bey iyice sinirlendi [1, s. 156].
4. *Çapaklı* Bayram kulağını vermiş, yerdeki çıtırtıları dinliyordu [2, s. 192].
5. *Değirmenci* Abdullah'a, yirmi dört şinikte birer şinik hak verdiler [2, s. 257].

**Mürəkkəb ləqəblər:**

1. *Eğnelbaşı Çapar* Kazım, durup durup, “Heyy!” çekiyor, ırgatları isteklendirmeğe çalışıyordu [1, s. 100].
2. *Akdereli* İbrahim'i at tepmişti [1, s. 194].

**Nəticə**

Ləqəblər ad sistemində yerinə, funksiya və ümumi prinsiplərinə görə digər köməkçi adlardan fərqlənirlər. Onlar şəxsin həm müsbət, həm də mənfi xüsusiyyətlərini əks etdirir. Şəxsin fəaliyyəti, xarakteri və s. dəyişdikcə ona verilən ləqəblər də dəyişə bilər. Ləqəblər həm də zəngin semantik sistemə malikdir. Həqiqi mənalı ləqəblərlə yanaşı, məcazi və metaforik ləqəblər də mövcuddur. Beləliklə, bu gün “ləqəb” məişət leksikasının ayrılmaz hissəsi olub, antropoloji kateqoriyalar arasında dinamik cəhətdən inkişaf edən, kənd ərazilərində, xalq arasında genişlənərək artan dil vahididir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Baykurt F. (1976). Irazcanın Dirliği. İstanbul, Remzi Kitabevi Yayınları, Cağaloğlu. 238 s.
2. Baykurt F. (1976). Köygöçüren. İstanbul, Remzi Kitabevi Yayınları, Cağaloğlu. 423 s.
3. Haqverdiyev Ə. (2005). Seçilmiş əsərləri. İki cilddə, I cild. Bakı, Lider. 504 s.
4. Həsənov H. (1980). Təxəllüslər və ləqəblər. Bakı. “Elm və həyat” jurnalı, № 1, s. 38.
5. Mirzə İ. (1961). Böyük dayaq. Bakı, Azərbaycan dövlət nəşriyyatı. 612 s.
6. Mikayılova Ə. (2008). Onomastik vahidlərin üslubi imkanları (XIX əsrin ikinci yarısında yaranmış nəsr əsərlərinin materialları əsasında linqvistik tədqiqat). Bakı, “Memar Nəşriyyat – Poliqrafiya” MMC. 302 s.
7. Muğanna İ. (2009). Seçilmiş əsərləri. Altı cilddə, I cild. Bakı, Avrasiya Press. 424 s.
8. Muğanna İ. (2009). Seçilmiş əsərləri. Altı cilddə, II cild. Bakı, Avrasiya Press. 432 s.
9. Verdiyeva Z. (1990). Köməkçi ad kateqoriyaları. Bakı, Maarif. 225 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2024, №4 (282), 114 – 135
doi.org/10.48445/j1841-3590-5997-o



# XX əsr özbək ədəbiyyatının görkəmli nümayəndəsi Şöhrətin sənətkarlıq məharəti və üslubu

***Nodirə Soatova***
Filologiya elmləri doktoru, professor, Cizzax Dövlət Pedaqoji Universiteti. Özbəkistan.
E-mail: nodira.soatova@list.ru
https://orcid.org/0000-0002-4310-6011

**XÜLASƏ**
Məqalə XX əsr özbək ədəbiyyatının inkişafında Şöhrət yaradıcılığının roluna həsr edilmiş, insan ruhunun və emosional yaşantılarının poeziyada ifadəsi, üslub və ifadə imkanları, janr və üslub rəngarəngliyi təhlilə cəlb edilmişdir. Məqalə Şöhrət poeziyasının onun nəslinin digər yaradıcıları ilə müqayisəsi əsasında ənənəviliyi, davamlılığı və yenilikçi xüsusiyyətlərinin aydınlaşdırılması; şairin lirik-epik və dramatik əsərlərində xalq pafosunun əks olunması, poetik təfəkkürün yenilənməsi, əsərlərində folklorizmin bədii funksiyalarının müəyyənləşdirilməsi; süjet, kompozisiya, baş qəhrəmanın fərdi xarakteri, onların bədii təfəkkürdə yerini yeni bədii-estetik baxışlar əsasında nəzəri əsaslandırılması; yazıçının romanlarında bədii ideya və obrazların funksiyalarını, folklorşünaslığı və ədəbi təsirini, tarixi həqiqətin bədii dərkini, poetik nitqi, ifadədə lakonik formanı, fəlsəfi müşahidənin dərinliyini, məntiqi ardıcıllığı, poetik obrazda bədiilik meyarlarını müəyyən etməkdən ibarətdir.

**AÇAR SÖZLƏR**
poetik aləm, lirik obraz, ədəbi-estetik baxış, didaktik məzmun, obrazlı üsul

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 05.10.2024
Qəbul edilib: 25.11.2024

ПРЕПОДАВАНИЕ АЗЕРБАЙДЖАНСКОГО ЯЗЫКА И ЛИТЕРАТУРЫ
2024, № 4 (282), 114 – 135
doi.org/10.48445/j1841-3590-5997-o

**ТУРЕЦКАЯ ЛИТЕРАТУРА**

# Художественное мастерство и стиль Шухрата, выдающегося представителя узбекской литературы XX века

***Нодира Соатова***
Доктор по филологическим наукам, профессор, Джизакский Государственный Педагогический Университет. Узбекистан.
Е-маил: nodira.soatova@list.ru
https://orcid.org/0000-0002-4310-6011

**АННОТАЦИЯ**
Статья посвящена творчеству Шухрата, видного представителя узбекской литературы XX века, выражению человеческого духа и душевных переживаний в поэзии, анализируются стиль и выразительные возможности, жанровое и стилевое разнообразие. Выяснение традиции, преемственности и новаторских особенностей поэзии художника на основе сравнения с другими творцами его поколения; отражение народного пафоса в лирико-эпическом и драматическом творчестве поэта, обновление поэтического мышления, определение художественных функций фольклоризма в его произведениях; сюжет, композиция, индивидуальность главных героев, их место в художественном мышлении, основанном на новых художественно-эстетических взглядах; оно состоит в определении критериев художественности поэтического образа.

**КЛЮЧЕВЫЕ СЛОВА**
поэтический мир, лирический образ, литературно-эстетический взгляд, дидактическое содержание, образный метод

**ИСТОРИЯ СТАТЬИ**
Отправлено: 05.10.2024
Принято: 25.11.2024

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2024, NO. 4, VOL. 282, 114 – 135
doi.org/10.48445/j1841-3590-5997-o

**TURKISH LITERATURE**

# The Artistry and Style of Shukhrat, an Outstanding Representative of Uzbek Literature of the Twentieth Century

***Nodira Soatova***
Doctor of Philological Sciences, Professor, Jizzakh State Pedagogical University. Uzbekistan.
E-mail: nodira.soatova@list.ru
https://orcid.org/0000-0002-4310-6011

**ABSTRACT**
The article is devoted to the work of Shukhrat, a prominent representative of Uzbek literature of the 20th century, the expression of the human spirit and emotional experiences in poetry, the style and expressive possibilities, genre and stylistic diversity are analyzed. Clarification of the tradition, continuity and innovative features of the artist's poetry based on comparison with other creators of his generation; reflection of folk pathos in the lyric-epic and dramatic creativity of the poet, renewal of poetic thinking, definition of the artistic functions of folklorism in his works; plot, composition, individuality of the main characters, their place in artistic thinking based on new artistic and aesthetic views; it consists in determining the criteria of artistry of a poetic image.

**KEYWORDS**
poetic world,
lyrical image,
literary-aesthetic view, didactic content,
figurative method

**ARTICLE HISTORY**
Received: 05.10.2024
Accepted: 25.11.2024

## Введение

В исследовании развития узбекской литературы XX века с точки зрения содержания и формы, во-первых, показывает, «...усиление роли и влияния людей художественного творчества в жизни нашего общества», а во-вторых, помогает определить, как писатели выполняют свои задачи, а также выдают свои выводы об обновляющемся обществе и жизни. Необходимо войти в творческую лабораторию Шухрата (Гулома Алимова), одного из известных представителей новой узбекской литературы, для дальнейшего углубления исследований по научной оценке его произведений, отражающих дух нации, различные сцены народной жизни, с точки зрения художественного мастерства.

## Основная часть

Шухрат «…вывел узбекскую поэзию из уровня посредственности и усердно работал над ее возвышением» [2; с. 147 − 157] с точки зрения преемственности, продолжая традиции народного тона и параллелизма. Параллелизм (в литературе) – один из приемов поэтической речи и изобразительных средств. Параллелизм требует одинакового или точно такого же расположения речевых элементов из взаимосвязанных частей художественного текста. Обычно он описывает два события рядом (параллельно). Это может быть проявлено на примере демонстрации взаимного сходства изображения, взятого с натуры, и изображения, взятого из человеческой жизни, а также на основе сравнения противоположных сторон двух похожих изображений. Принимая во внимание тот факт, что параллелизм был сначала широко распространен в народном устном творчестве, а затем ассимилирован в художественной литературе» [3, с. 68 − 69] и «в поэзии 70 − 80-х годов XX века, авторы либо полностью, либо частично приняли существующие фольклорные традиции и создали оригинальные (неподражаемые) произведения, адаптировав их к новым условиям» [4, с. 16], – данные взгляды полностью оправдывают творческое освоение этой традиции Шухратом. В поэзии Шухрата мы пытаемся раскрыть традиции параллелизма в фольклоре, исходя из следующих принципов:

- показание роль народных песен в художественной структуре стихов Шухрата;
- обоснование связи сердечных страданий в стихах с жизнью поэта через явление параллелизма;
- анализирование народных стихотворений, созданных на основе явления

параллелизма поэта;

- определение роль Шухрата в узбекской детской поэзии.

Глубокое понимание сути поэзии, готовность всегда бороться со злом во имя добра, наравне с отважными богатырями, подобными лирическому герою, и есть главное качество лирического героя Шухрата. Это качество, определяющее сущность лирического героя поэта, как бы возносит лирику Шухрата на божественные высоты.

*Ты, он и я – не пламя в огне, все безразличны,*
*То скажи кто горящий заботами мира сего?*
*Меня не волнует лето или зима Вселенной,*
*Если в сердце у каждого нет сверкающего огня* [5, с. 133].

Такое глубокое понимание сути поэзии, готовность всегда бороться со злом во имя добра, наравне с отважными богатырями, подобными лирическому герою, и есть главное качество лирического героя Шухрата. Это качество, определяющее сущность лирического героя поэта, как бы возносит лирику Шухрата на божественные высоты. Лирический герой стихотворения становится параллелен со словами «я», «ты», «он» и при достижении взаимного параллелизма со словами «огонь», «горящий». Используя в стихотворении искусство параллелизма, поэт призывает людей всегда жить на благо страны. Он считает, что в каждом человеке, в сердце которой должен быть «огонь». Если в его сердце нет огня, какая польза от его человечности? – таков вывод из идейного содержания стихотворения.

Шухрат стремился открыть секреты художественной красоты и совершенства в процессе изучения народного творчества, чтения и наслаждения народными сказками и героическим эпосом, и достиг в этом деле такого мастерства, что, когда мы читаем его лучшие стихи, кажется, что от них исходит духовность узбекского народного творчества. Это положение гарантировало художественное совершенство стихов поэта. При наблюдении постепенного развития стихов поэта, посвященных детям, становится ясно, что сначала он писал небольшие стихотворения, а затем перешел к созданию содержательных стихов. Главные черты детской литературы – простота, искренность, просвещение и воспитание, в полной мере воплотившиеся в таких стихотворениях Шухрата, как «Бабушка», «Дорога твоего дедушки», «Где мой сахар?», «Перо и Адхам», «Резинка».

Из проанализированных стихотворений Шухрата видно, что он не только очаровывал юных читателей своей народной манерой изложения, сюжетом и

композицией, а также своим неповторимым приёмом создания поэтического образа, но и учит их мыслить, различать добро и зло, выбирать правильный путь при столкновении с непонятными вопросами.

Несколько аспектов формирования литературного обаяния лирики Шухрата: во-первых, искренность, наблюдательность, эмоциональная восторженность в поэзии поэта; во-вторых, глубокая художественное описание чувств и душевных переживаний лирического героя; в-третьих, выражение вопросов, связанных со смыслом человека и жизни, с философской глубиной; в-четвертых, умелое использование поэтических искусств. Мысли и наблюдения о таинственном мире, окружающем человека, и судьбе о нём во Вселенной в поэзии Шухрата философских выводы, обобщений и заключений, характерны и свойственны много повидавшим людям. Шухрат сохраняет в этом творческом процессе свою индивидуальность, он приходит к этим выводам и обобщениям, анализируя собственный жизненный опыт, пройденный и выбирает путь жизни. Мысли и наблюдения, проникнутые такими философскими размышлениями, часто приходят на его воображение, когда лирический герой поэта живёт вдали от жаркой жизни, когда его не окружают теплые объятия родных и близких. Такое душевное состояние играет основную роль в создании стихов, в которых преобладают философские мысли.

*Тот, который забыл свою мать,*
*Не будет у него и родного языка.*
*Тот, который забыл свой родной язык,*
*И не будет у него нации родной.*
*Ты разве забыл свой родной язык?*
*Забудь свою нацию и матушку родную.*
*Ну, какая надежда жизни!*
*Ты тогда не мужчина, и не дитя,*
*Ты вроде человек,*
*Бродившейся по матушки земле, но*
*Ты как существо –* «*мангурд*».

При чтении этого стихотворения Шухрата содержится важная для читателя философская мысль, прославляющая человечество – любовь к матери, родному языку, Родине и почитание ее есть выражение качеств, соответствующих духу,

природе и обычаям нашего народа. Свой неповторимый характер поэт может проявить в духовном мире своего лирического героя. В стихотворении поэт подходит к каждому слову с ответственностью. Он неравнодушен к той идеи, которую хочет выразить, наоборот, призывает лирического героя раскрыть тоску, гнетущую его в сердце, стремиться всегда быть верным своей матери, родному языку и Родине, как достойное сын народа. Если нет, то он, вероятно, превратится в чудовищное существо как «мангурд».

Поэт не теряет веры в свою красоту, добро и светлое будущее даже в часы, прожитые среди таких душевных переживаний. Вот почему его лирический герой всегда живет и дышит в лоне животворящих идей. Философская идея стихотворения Шухрата «Заря расцветает» чрезвычайно глубока: Автор сочетает в сердце читателя зарю человеческой жизни с образом ясного утра.

*Рассвет! Встречай и приветствуй рассвет,*
*Наслаждайся весь день в утреннем удовольствии!*
*Будь благодарен дню, рассветающему так ярко,*
*День близится, лучезарным ярким светом!*

Интерпретируя действительность, поэт пытается внедрить суть жизни в сердце читателя и достигает определенного успеха. Художественное открытие в стихах поэта произошло от осмысления новых идей из этой действительности и выражения их по-своему. Поэт сумел вселить в строки стихотворения выражение своих болезненных переживаний, пропитанных глубокой философской мыслью, чтобы усилить идейно-эстетическое впечатление. «Это мастерство позволяет открывать внутренний мир не всегда в одном и том же положении, а в новой ситуации, каждый раз под новым углом» [6, с. 21].

*Древняя крепость, каменная крепость,*
*Высокомерна стоишь одна на вершине горы.*
*Униженная крепость, вопиющая слезами в глазах,*
*Ибо есть у тебя просьба для грядущего поколения?*

Поэт применил литературный приём «такрир» (анафора), «ташхис» (олицетворение) и «тазод» (антитеза) с помощью слова «крепость», выражая характер высокомерия и унижение, свойственному человеку, выражая характер высокомерия и унижение, свойственному человеку. Посредством такого описания неодушевленных и абстрактных вещей некоторые идеи, выдвигаемые

поэтом, обретают ясность, яркость и привлекательность. В целом, мир чувств поэта переполняется во время встреч с природными пейзажами – родниками, горами, реками и морями, во время тихих ночей, когда звучит песня луны и звезд. В этом смысле пейзажная лирика Шухрата представляет собой художественный мир, в котором ярко выражены страстные чувства поэта того времени.

Известно, что в искусстве «...человеческие переживания составляют субъективную сторону реальной человеческой жизни, а личность – объективную сторону жизненного пути» [7, с. 13]. С этой точки зрения изменения в душевном мире поэта, страдания, подавленность или воодушевление обусловили появление в его творчестве стихов разного настроения. При написании басни «Лисица и Заяц» заметно, что он вдохновлялся притчами знаменитого русского баснописца И. А. Крылова и узбекского поэта-сатирика Гулхани. Ведь читая басню Шухрата, на ум приходит притча русского поэта «Волк и Лиса». Но это не значит, что эти и другие басни Шухрата написаны в стиле притч Крылова. Эта ситуация дает полное основание говорить, что басни Шухрата являются оригинальными притчами.

Образ лисы в басни Шухрата «Лисица и Заяц» является не только живым символом лицемерия, нечестности и маловерия, но поэт видел немало лицемерных людей, похожих на лисиц. Один из них «нашел» в творчестве поэта политические ошибки, обвиняя его в национализме и направил клеветническое письмо объемом 20 − 25 страниц в газету «Правда» в Москве, а другой поддержал клеветника при обсуждении этого письма в Союзе писателей. Третий дал показания на поэта следователю, когда тот сидел в заключении по политическим обвинениям. В этой басни Шухрата лицемерие реальных людей воплощается в образе *Лисы*, а в других притчах такие неверные люди обрели свою вечность в образе различных животных.

Притча Шухрата «Лягушка» также по содержанию не уступает басне «Лисица и Заяц». Эта богатая наблюдениями и образами притча открыла новую страницу в баснословном творчестве поэта. На наш взгляд, цель поэта при написании этой притчи выражена в стихах: «Согласен лаять по-собачьи, хоть и быть лягушкой, я согласен». Самым трудным для поэта является не смерть, а то, что остаться вне поля зрения нации. Человек, причинивший кому-то или другим зло, хоть он и избежал царского гнева, остается под проклятием земли и народа, это для него хуже смерти. В этой притче Шухрат описал бесчеловечность таких людей в образе *Лягушки*. Поэт преподает идею в притче, как бы внушая ее каждой клетке читателя о том, что люди, ставшие *лягушками*, обречены на кару Бога, и их

грязная жизнь не должна быть примером для других. Автор делится своими философскими взглядами на жизнь, то есть она настолько сложна, что при слабости воли не исключено, что любой храбрец, борец проиграет на поле этой борьбы. В сатирической поэме «Был волком, стал лисой» поэт описал возможность подлеца принять более отвратительный вид.

Ахмад Яссави:

*Тот, кто вступит на путь похоти, будет посрамлен,*
*Он сбивается с пути, поскользнётся и будет грешен* [8, с. 102],

– в своих строках он имел в виду, что эго – внутренний враг, если даже и враг, то очень враждебный, и в результате подчинения и преодоления им может быть нарушена целостность человека и его духовная и мирная жизнь может закончиться. Герой поэмы Алиджан Полван, по словам Яссави, раб алчности, человек, чья жизнь сошла с рельсов. Человеческий род создан для того, чтобы добро (благо) и зло (порочность) жили бок о бок. Поскольку поэт в произведение безжалостно обличает пороки, характерные для героя Алиджана палвана отрицательный образ воплощается в полной мере.  И так «Невежда – осел. Может хуже осла. Что ни нагружешь на осла, он его и понесет, и куда ни толкни, он уйдет в ту сторону, нет у него не разума и у нас нет претензии. Его работу можно неблагодарить и не уделить внимания. Назвать невежду ослом правильно, но осел приносит пользу, а невежда никакой:

*У одного много умений, а у другого много золото,*
*Мудрецам лучше знать, какой из них лучше»* [9, с. 75],

– лирический герой Алишера Навои, невежественный, как осел, чем-то напоминает палвана Алиджана, героя поэмы Шухрата «Был волком, стал лисой». Мысль, которую поэт хочет выдвинуть в сатирической поэме «Назойливая муха», просматривается в последнем четверостишии – «…метафорический способ выражения, т.е. перенос значения слов на другой предмет, создание аллюзий, ирония или символов» [10, с. 143].

При чтении эпопеи «Дитя» у читателя создается впечатление, что произведение посвящено теме Второй мировой войны. Однако в основе произведения первенствовали мечты и страдания поэта, связанные с тоталитарным режимом, старомодностью, подавлением наших национальных ценностей, осужденных как национализм. Например:

*Скажите родные, посетить могилу отца,*
*Разве это преступление?*
*Или молится... Разве это преступление?*
*Патриотизм – защитить честь отца и любить Родину,*
*Разве это преступление?* [11, с. 96]

Тоталитарный режим разрушил традиции и ценности нашего народа, которые передавались из поколения в поколение. Их заклеймили «врагами народа». Запрещалось упоминать их имена и читать их произведения. В 1956 году проявились трагические последствия культа личности Сталина, и даже после того, как жертвы в мировой литературе были оправданы, палачи 1937 года не давали покоя последователям Чулпана и Кадыри, таким как Шухрат, Шукрулло, Саид Ахмад. Тем не менее, Шухрат смело продолжал освещать аспекты этой темы в эпосе «Мечта и месть» и других произведениях. В своем эпосе поэт создал образ Самада, правдивого лидера, умеющего смело противостоять несправедливости жизни и считающего своим долгом защищать права человека. Вот проблемы, которые его беспокоили... Вот вопросы, которые бросают тень прошлого на спокойную и счастливую жизнь народа и зовут лирического героя на трибуну:

*Хватит, теперь столько порочности,*
*Есть и для нас утро блаженство?*
*Или еще давит в нашу грудь?*
*Ржавеющая от боли и тьмы?..*
*Где милосердие, где справедливость?*
*Где человеческое достоинство?!...*
*Смело боротся против тирании «за права!»*
*Разве это преступление?*

В балладе «Гульдурсун» Шухрат прокрутил историю Старого Хорезма и обнажил личность предателя Родины, народ за свою «любовь», а точнее, животную похоть. На наш взгляд, единственная цель поэта в освещении этих тем состоит в том, чтобы человек никогда не запятнал своего почетного звания человека, не потерял веру, не уклонился от своей великой цели. Эта мысль охватывает балладу от начала до конца.

Словом, эта мысль звучит в большинстве поэтических и прозаических произведений Шухрата в различных формах – то в напряженной речи героев, то

